Möhsin Qəraəti

# MƏSƏLLƏR

# 100 SUAL-CAVAB

TƏRCÜMƏ EDƏN:
MƏHƏMMƏD AZƏRİ



# Mündəricat

## MƏSƏLLƏR

**Kitab haqqında**

Entesharate Daneshe-hamedun

Kitabın adı:.......Məsəllər

Müəllif:..Möhsin Qəraəti

Tərcümə edən:........Məhəmməd Azəri

Nəşr edən:.......... Daneshe-hamedun

Çap tarixi:......۲۰۰۴

Çap növbəsi:..........Birinci

Tiraj:.۳۰۰۰

səh:۱

**(MƏSƏLLƏR (Sual-cavablar**

**dən ۲۰-ə kimi olan suallar-۱**

?Sual ۱: Nə üçün Allah yaranışa əl qatıb, bir bu qədər mövcudu, eləcə də, insanı yaradıb

Cavab: Əgər gözəl nitqi olan bir alim danışarsa, ondan nə üçün danışdığı soruşulmamalıdır. Çünki malik olduğu elm və

natiqlik onu öz biliklərinin bəyanına vadar edir. Əgər o susub, elmini gizlədərsə, bu iş .sual doğura bilər

Qadir, həkim və mehriban Allah torpaqdan buğda, buğdadan nütfə, nütfədən kamil !?insan yarada bildiyi halda, nə üçün də yaratmamalıdır

?Sual ۲: Allaha inam insanın həyatında nə rol oynayır

Cavab: Sahibsiz, nəzarətsiz, səliqə-səhmansız bir mənzilə daxil olan insan istədiyini edə bilər. Əgər o, könlündən keçəni etməsə, səbəbsiz olaraq ləzzətlərdən məhrum qalır. Amma sahibli, müxtəlif nöqtələrində kameralar quraşdırılmış, səliqə-səhmanlı .evə daxil olan şəxs özünü evin qanunlarına uyğun aparmağa vəzifəli və məcburdur

Varlıq aləminin Allah kimi sahibi olduğuna, əməllərinə görə sorğu-suala çəkiləcəyinə inanan, başqa sözlə, iman gətirən insan nəfsini cilovlayaraq, Allahın qanunlarına tabe olacaq. İmanlı insan bütün əməllərinin nəzərdən keçiriləcəyinə əmin olduğu üçün .Allahın bəyənmədiyi işlərə yol verməyəcək

Sual ۳: Üzümüzü Kə`bəyə tutub namaz qılmağımızı əmr etmiş Allahın bizim ?ibadətimizə ehtiyacı varmı

Cavab: Hamı evini üzügünəşə tiksə, günəşin işığı artmaz və əksinə, hamı evini arxası günəşə tiksə, onun işığı azalmaz. Günəşin insanlara heç bir ehtiyacı yoxdur. Amma .insanlar günəşin işıq və istiliyinə ehtiyaclı olduqlarından evlərini üzü günəşə tikirlər

Namazı əmr etmiş Allahın bizim ibadətimizə heç bir ehtiyacı yoxdur. Amma insanlar Allaha üz tutmaqla onun lütfündən faydalanır və inkişaf edirlər. Qur`anın "İbrahim" surəsinin ۸-ci ayəsində buyurulur: «Əgər bütün insanlar kafir olsalar, Allaha zərrəcə «.tə`sir etməz. Çünki, O bütün insanlardan ehtiyacsızdır

?Sual ۴: Nə üçün salehlər çətinlik, günahkarlar isə rifah içində yaşayır

Cavab: Allah salehləri, öz dostlarını sevdiyi üçün hər hansı səhvə görə onları dərhal cəzalandırır ki, onlar öz səhvlərinə diqqətli olsunlar. “Haqqə” surəsinin ۴۴-۴۵-ci ayələrində buyurulur: “Əgər peyğəmbər bizə istinad edərək özündən sözlər danışsa, ”.ondan mütləq intiqam alarıq

Mö`minlər də belədir. Səhv edən kimi cəzalandırılırlar. Günahkarlara isə əvvəlcə möhlət verilir, möhlət başa çatdıqdan sonra onlar əzaba düçar olurlar.(۱) İslahına ümid olmayan kafirlərə qiyamət gününədək möhlət verilir ki, günahlarını daha da (artırsınlar.(۲

Əgər eynəyinizin şüşəsinə bir damla çay sıçrasa, onu dərhal silirsiniz. Bu çay damlası paltarınıza düşsə, səbr edir, evdə paltarınızı dəyişirsiniz. Amma bu damla döşəməyə .sərdiyiniz xalının üzərinə düşsə xalını yumaq qalır novruz bayramına

.Allah da hər kəslə onun şəffaflığına uyğun rəftar edir

?Sual ۵: Nə üçün bütün əməllərin qəbulu namazın qəbulundan asılıdır

Cavab: Yol polisi bir maşını saxladığı vaxt ondan sürücülük vəsiqəsi tələb edir. Nə şəxsiyyət vəsiqəsi, nə partiya bileti, nə ev kitabçası, nə idman dərəcəsi sürücülük vəsiqəsini əvəz edə bilmir. Bu vəsiqə yoxdursa avtomobil saxlanılır. Qiyamətdə məqsədə çatmaq üçün isə namaz qəbul olmalıdır. Namaz qəbul deyilsə, heç bir əməl .qəbul deyil

?Sual ۶: Necə olur ki, bə`zi əməllərə görə saysız hesabsız mükafat verilir

Cavab: Rəvayətə görə, camaat namazında namaz qılanların sayı çox olduqca qılınan .namazın savabı da çox olur. Bu say on nəfərə çatarsa, namazın savabı hesaba gəlməz

İnsan bir barmağı ilə telefon nömrəsi yığa bilirsə, iki barmağı ilə bir çimdik duz götürə bilir, üç barmaqla qələmi



---

.Kəhф”, ۵۹“ [۱]-۱

tutmaq mümkün olur. Amma on barmaqla görüləsi mümkün olan işlər saysız-.hesabsızdır

?Sual ٧: Qur`anda bə`zi insanların heyvana bənzədilməsi təhqir deyilmi

Cavab: Heyvanların faydası və bə`zi insanların əməlləri nəzərdən keçirilsə Qur`anın "onlar heyvan kimidirlər, bəlkə, daha çox zəlalətdədirlər"(١) bənzətməsinin məntiqə .uyğun olduğunu görərik

Ən qiymətli libas ipəkqurdunun hazırladığı ipəkdən istehsal olunur. Ən mühüm qidalar heyvanlardan alınan ət, yağ, süd, qatıq, bal və sair ne`mətlərdir. Heyvanlar nəqliyyat vasitəsi kimi istifadə olunur, onların köməyi isə torpaqlar basdırılmış minalardan təmizlənir. İnsanlar bir çox biliklərini heyvanlardan əxz etmişlər. Adəm övladı ölünün dəfnini qarğadan öyrəndi, şanapipik səba xalqından Süleymana xəbər gətirdi, hörümçək öz toru ilə İslam peyğəmbərini qorudu. Heyvanlar əhilləşmək qabiliyyətinə malikdirlər. Məsələn, tə`lim görmüş itin etdiyi ov halaldır. İlan kimi bir zərər verici .yalnız ona yaxınlaşanları çalır

Amma elə insanlar var ki, atom bombası ataraq bəşəriyyətin məhvinə fərman verir. İlan belələrindən üstün deyilmi?! Gecə-gündüz insanların maddi və mə`nəvi varlığını məhv etmək üçün ölkələrə təcavüz edənlər, məzlum xalqların qanını axıdanlar, azadlıq !?pərdəsi altında əxlaqsızlıq təbliğ edənlər heyvandan pis deyilmi

?Sual ٨: Həqiqəti olduğu kimi görə bilərikmi

Cavab: "Bəqərə" surəsinin ٢٨٢-ci ayəsində buyurulur:"Allahdan çəkinin ki, o sizə həqiqəti öyrətsin". Təqva bütün pisliklərdən və çirkinliklərdən uzaq olmaqdır. Günahkar insan bir çox həqiqətləri dərk etməkdə acizdir. Öz irqinin, millətinin, partiyasının mənafeyini hər şeydən üstün tutan insan gözünə qırmızı şüşəli eynək .taxıb, portoğalı pomidora oxşadan adam kimidir



---

.Ə`raф", ١٧٩" [٣]-١

Yalnız hamar güzgü hər şeyi olduğu kimi göstərir. Çökək güzgü hər şeyi kiçildir, qabarıq güzgü hər şeyi böyüdür. İnsanın qəlb aynası da hamar olmalıdır. İstənilən bir .günah ona ləkə salır. Günah göz qarşısındakı mənzərələri dalğalandıran ilğım kimidir

?Sual ۹: Bütün müsəlmanlar mö`mindir, yoxsa müsəlmanla mö`min arasında fərq var

Cavab: "Nəsr" surəsinin ikinci ayəsində insanların dəstə-dəstə Allahın dininə daxil olduqları bildirilir. "Hucurat" surəsinin ۱۴-cü ayəsində isə bəyan olunur ki, "hələ ki, iman sizin qəlbinizə daxil olmayıb." Ayədən göründüyü kimi, insanların dinə daxil olması .kifayət deyil və müsəlman olmaqla mö'min olmaq arasında fərq var

Dindarlığın mərhələləri var: qızma, qaynama və bişmə. Həm isti, həm də qaynayan şey .soyuya bilər. Amma bişmiş şey yenidən çiy ola bilməz

Dinə daxil olmaq asandır. "Əşhədu ənla ilahə illəllah və əşhədu ənnə Muhəmmədən .rəsulullah" deyən şəxs müsəlman olur. Bu qızma mərhələsidir

Peyğəmbərin səhabələri qaynar bir eşqlə cəbhəyə gedər və haqq yolunda canlarından keçərdilər. Bu, qaynama mərhələsi idi. Amma Qur`an bu insanlara buyurur: "Ələ keçirdiyiniz qənimətin beşdə birini xüms ödəyin."(۱) "Onların öz Rəbbi yanında dərəcələri vardır."(۲) "İman gətirmədikləri halda "Allaha və qiyamət gününə iman (gətirdik" deyənlər var."(۳

Bəli, şəhadət kəlmələrini deyənlər, hətta peyğəmbərlə çiyin-çiyinə vuruşanlar üçün qarşıda həqiqi imana aparan yol var. Həqiqi imana çatmaq üçün bir çox mərhələlərdən .keçmək lazım gəlir



---

.Әнфал", ۴۱" [۴] -۱

.Әнфал", ۴" [۵] -۲

.Бәгәрә", ۸" [۶] -۳

Sual ١٠: İnsanların islahı (əmr be mə`ruf və nəhy əz münkər) ilə məşğul olmaq bütün ?müsəlmanlar üçün, yoxsa xüsusi bir qrup üçün vəzifədir

Cavab: Əgər birtərəfli yolda bir maşın hərəkətin əksinə şütüyərsə, ona həm yoldakı .maşınlar xəbərdarlıq etməli, həm də polis bu maşını saxlamalıdır

Allah insanların doğru yola də`vətini və pis yoldan çəkindirməsini bütün müsəlmanlara əmr edir: "Siz ən xeyirli ümmətsiniz. İnsanlara yaxşı işlər görməyi əmr edir və pis (əməllərə qadağa qoyursunuz."(١

Bu surənin ١٠۴-cü ayəsində oxuyuruq: "Aranızda xeyirli işlər görməyi əmr edən və pis ".əməllərə qadağa qoyan bir dəstə olsun

Sual ١١: Allahın yalnız təqvalılardan əməl qəbul etməsi adi və günahkar insanları ?ümidsizləşdirmirmi

Cavab: Qur`an buyurur: "Allah yalnız təqva sahiblərindən (pəhrizkarlardan) qəbul (edər."(٢

Təqvanın dərəcələri var. Kimi Allahdan çox, kimi isə az qorxur. Amma hamı nə dərəcədəsə varlıq aləminin sahibindən çəkinir. "Allah yanında ən hörmətli olanınız ən (təqvalınız, Allahdan ən çox çəkinəninizdir."(٣

.Əgər insan xeyir bir iş görürsə, deməli, nə dərəcədəsə təqvalıdır

Əgər dünya çempionatında ən güclülər birinci yeri tutursa, bu o demək deyil ki, başqaları idmandan əl çəkməlidir. Dünya çempionatından əlavə, ölkə, əyalət, şəhər və kənd birincilikləri də keçirilir. Bu yolla hər bir idmançı öz qabiliyyətinə uyğun mükafat .alır

Bundan əlavə, əməlin qəbul dərəcələri də var. Hər bir təqva dərəcəsinə uyğun qəbul dərəcəsi var. Ona görə də Qur`an bəyan edir ki, kiminin mükafatı ikiqat, kimininki on ,qat

١- [٧] “Али-Имран”, ١١٠.

٢- [٨] “Маидә”, ٢٧.

٣- [٩] “Һуҹурат”, ١٣.

kimininki isə saysız-hesabsız olur. Bu fərqlərdə insanın niyyəti və gördüyü işin növü (əsas rol oynayır.(١)

?Sual ١٢: Bəşəriyyət səma kitabına ehtiyaclıdırmı

Cavab: Bütün zavodlar istehsal etdikləri məhsulu satışa çıxararkən ona “istifadə qaydaları” adlı kitabça əlavə edirlər. İstehsalçıdan başqasının belə bir kitabça !yazmağa ixtiyarı varmı? Əlbəttə ki, yox

İnsanın da yaradanı var və bu yaradan ona Qur`an adlı göstəriş kitabı göndərmişdir. Öz xəlq etdiyini və onun ehtiyaclarını, Yaradan hamıdan yaxşı bildiyi üçün başqaları bu xilqətə göstəriş verə bilməz. “Məgər yaradan bilməzmi?! Allah incəliyinə qədər (xəbərdardır.”(٢)

Allahın qanunlarını kənara qoyub öz qanunları ilə yaşamaq istəyən insan təyyarəni .qırmancla sürmək fikrinə düşmüş çobana bənzəyir

?Sual ١٣: Rahat yaşamaq üçün nə edək

Cavab: Qur`an buyurur: “Əlinizdən çıxana kədərlənməyin, əlinizə bir şey gələndə şad (olmayın.”(٣)

?Doğrudanmı, insan belə ola bilər

Bank işçisi bir gün xalqdan pulu toplayır, səhəri gün isə onu xalqa paylayır. Bu işçi üçün .pulu almaqla verməyin heç bir fərqi yoxdur. Çünki, o, sadəcə, əmanətçidir

Traktor üçün asfaltla torpaq yolun fərqi yoxdur. Velosiped üçün isə asfalt yol daha .rahatdır. Sərçə qonduğu budağı zədələmədiyi halda, zərif çiçəyi öz oturuşu ilə qırır

Bəli, böyük insanların ruhunu kiçik çətinliklər sındıra bilmir. İmam Hüseyn (ə) qanlı Aşura günü sinəsinə yüzlərlə ox tuşlandığı halda diqqət və səmimiyyətlə namaza .durdu

١- [١٠] “Бәгәрә”, ٢٤٥, ٢٦١; “Сәҹдә”, ١٧; “Ән`ам”, ١٦٠; “Бәгәрә”, ٢٦٥; “Али-Имран”, ٣٧.

٢- [١١] “Мүлк”, ١٤.

٣- [١٢] “Һәдид”, ٢٣.

Hansı ki, əhəmiyyətsiz bir hadisəyə görə ya namazı yubadır, ya da diqqətimizi toplaya .bilmirik

Sual ١۴: Nə üçün İslamda əməlin dəyəri insanın niyyəti ilə ölçülür, onun qəbulu isə ?insanın diqqət və səmimiyyətindən asılı olur

Cavab: Dünya işləri də belədir. Həm cərrah, həm də qatil bıçaqla qarın yırtır. Cərraha təşəkkür olunur, qatil zindana salınır. Amma cərrah da cərrahdan üstün ola bilər. İnsan .həyatını xilas etmək niyyəti pul qazanmaq niyyəti ilə eyni deyil

Üç nəfərə su təklif edək. Onlardan biri susamadığı üçün, o biri küsdüyü üçün, üçüncüsü isə dördüncüyə su çatmaz deyə sudan imtina edə bilər. Bu üç nəfərin niyyəti fərqli olduğu kimi, əməllərinin dəyəri də fərqlidir. Əsil pul əskinasını saxta pul əskinasından ondakı xüsusi bir sap fərqləndirir. Həqiqi ibadəti saxta ibadətdən fərqləndirən bir sap (ip) da var. Bu, bəndənin yapışdığı Allah ipidir. Bu ip bəndənin Allaha yaxınlaşmaq niyyəti, xalisliyi, diqqət və səmimiyyətidir. Bu sap qırılsa, bəndənin Allahla rabitəsi .kəsilər

?Sual ١۵: Bütün yaxşı işlərin mükafatı on qat olurmu

Cavab: Qur`an buyurur: “Kim yaxşı bir iş görərsə ona həmin işin on qat əvəzi (verilər.”(١

Amma ən əsası bu işi görmək yox, onu qiyamət gününədək qorumaqdır. Verilmiş əmanəti yolda itirmək əmanətdarlıq deyil. Bir çox işlər xeyir hesab olunsa da son .məqsədə çatmadığı üçün puça çıxır

Xeyir işi görən adamın məqsədi özünü göstərmək, Allahdan qeyrisinin diqqətini cəlb etmək olsa, bu işin müqabilində axirət mükafatı yoxdur. Xeyir işi görən zaman və ya bu .iş başa çatdıqdan sonra insan günaha yol verərsə, qazandığı savab əlindən çıxar



---

.Əн`ам”, ١۶“ [١٣]-١

Demək, əsas məsələ görülmüş xeyir işi axirət gününədək qorumaqdır. Yuxarıdakı .Qur`an ayəsində də yaxşı iş görməkdən yox, yaxşı iş gətirməkdən danışılır

?Sual ۱۶: Nə üçün ölümdən qorxuruq

Cavab: Sürücü sükan arxasında o zaman qorxur ki, ya yanacaq tükənir, ya qaçaqmal ...aparır, ya sür`ət çoxdur, ya yol təhlükəlidir, ya yoldaşları pis adamdır

Ölümdən sonranı düşünüb, hazırlıq görən, günahdan çəkinən, mö`minlərlə dostluq .edən, bir sözlə Allahın razılığı üçün çalışan insan ölümdən çəkinmir

?Sual ۱۷: Nə üçün bə`zi dualar qəbul olunmur

Cavab: Əgər təyyarənin yanacaq bakına yanacaq əvəzinə su tökülərsə, təyyarənin uçuşu qeyri-mümkündür. Dua o zaman Allah dərgahına ucalar ki, insan haram tikədən çəkinsin. Hədisdə buyurulur: "Duasının qəbul olunmasını istəyən şəxs qazancını və (tikəsini pak etməlidir."(۱

Bundan əlavə, dua xeyir istəməkdən ibarət olsa da, bizim bir çox istəklərimiz öz .zərərimizədir

?Sual ۱۸: İslamda hər saatın öz duası var. Biz bütün günü dua oxumalıyıqmı

Cavab: Dua kitablarında günün hər saatı, ilin hər günü üçün dualar nəql olunsa da, insanın bütün bu duaları oxumağı vacib deyil. Avtovaqzalda günün hər saatı üçün reyslər nəzərdə tutulur. Məsələn, neçə saatdan bir Məşhədə avtobus yola düşür. Amma insan yalnız bir reyslə yola çıxa bilər. Hər saat üçün ona görə reys nəzərdə tutulur ki, hər kəs istədiyi vaxt yola düşə bilsin. Dualar da belədir. Nə vaxt dua etmək istəsən, həmin saatın xüsusi duası var. Amma əzbərlənməsi mümkün olan kiçik duaları .işdən ayrılmadan da oxumaq olar



---

.Бинар", ч. ۹۰, с. ۳۷۳" [۱۴]-۱

?Sual ۱۹: İnsanın başına gələn xoşbəxt və bədbəxt hadisələrdə Allahın rolu nədir

Cavab: Qur`an buyurur: “Sənə yetişən hər bir yaxşılıq Allahdan, pislik isə (özündəndir.”(۱

Həm öz oxu, həm də günəş ətrafında fırlanan yer kürəsinin bir üzü qaranlıq olur. İşıq .günəşdən, qaranlıq isə yerin özündəndir

Allah insan üçün faydalı olan üzümü yaratsa da insan ondan şərab düzəldib özünə zülm edir. Allah insana yaxşılıq edərək ona güc versə də, bə`ziləri bu gücü günah .yolda sərf edir

Ağıl Allahın ən böyük ne`mətlərindəndir. Amma bə`ziləri bu ağılı öz şər niyyətlərini həyata keçirmək üçün silaha çevirir. Deməmk, yaxşılıqlar Allahdan, pisliklərsə .özümüzdəndir

Sual ۲۰: Əgər namaz insanı çirkin işlərdən uzaqlaşdırırsa, nə üçün bə`zi namaz qılanlar ?günaha yol verir

Cavab: İçi boş toxum heç vaxt cücərmir. Qəlbin iştirak etmədiyi diqqətsiz namaz içiboş toxum kimidir. Dodaqların, belin, boyunun hərəkətindən əlavə, namazda qəlbin iştirakı .zəruridir

Məktəb və universitetin işi insanın elmi təkamülünü tə`min etməkdir. Bununla belə, hər məktəbə gedən şəxs elm sahibi olmur. Məktəb o zaman faydalı olur ki, insan oxuduqlarını dərk etsin. Yalnız həqiqi namaz insanı çirkinliklərdən uzaqlaşdırmaq (iqtidarındadır.(۲

Bu da həqiqətdir ki, günaha yol verən insan namaz qılandırsa, bir o qədər də ağır günaha yol verməyəcək. O, məcburdur ki, bədənini və paltarını pak saxlasın, namazını halal yerdə qılsın. Ağ paltar geyən insan çirkli yerdə oturmaq istəmədiyi kimi, namaz .qılan şəxs də çirkin işlərdən uzaq olmağa çalışır

Sual ۲۱: Əmr be mə`ruf və nəhy əz münkərin (islah tədbirlərinin) tə`siri yoxdursa, nə ?etməli

Cavab: Daha tə`sirli danışmaq qabiliyyəti olan şəxsdən xahiş edin ki, bu işi yerinə yetirsin. Allah-taala həzrət Musaya Fir`onun islahını əmr edəndə Musa daha üstün (bəyanı olan qardaşı Harunu köməkçi istədi.(۱

Bə`zən bir tərzdə deyilən söz tə`sirsiz olduqda başqa bir tərzdə təkrarlandığı vaxt tə`sir edir. Quru ağacı qırmaq üçün bir neçə balta zərbəsinə ehtiyac olur. Qur`anda buyurulur: "Tə`sirli olsun deyə, biz Qur`anda sözümüzü müxtəlif şəkillərdə bəyan (etdik."(۲

Sözün tə`sirində deyim tərzinin rolu var. Əmr be mə`ruf və nəhy əz münkərin .şərtlərinə görə hər insana söz deməyin öz yolu var

Əgər paltarınız toza bulaşmışsa onu çırpmaqla təmizləmək asan olar. Əgər hisə batmış paltarı çırpsanız həm əliniz qaralar, həm də his paltara yayılar. Qur`anda (buyurulur: "Evlərə qapılardan daxil olun."(۳

Eləcə də, xalqı günahdan çəkindirmək üçün onlara halal yol açmaq lazımdır. Həzrət Lut (evindəki qonaqlara təcavüz etmək istəyənlərə öz qızları ilə evlənməyi təklif etdi.(۴

Sual ۲۲: Bu gün dünyada inteqrasiya (əlaqə saxlama) güclənirsə, "nə şərq, nə də qərb" ?deməyimiz düzgündürmü

Cavab: "Nə şərq, nə də qərb" şüarını deməkdə məqsəd öz dinimizin, öz mədəniyyətimizin, öz iqtisadiyyatımızın əsas götürülməsidir. Müsəlmanlar dünyanın heç bir qüdrətli dövlətindən asılı olmamalı, şərqin kommunizm, qərbin kapitalizm xəstəliklərindən qorunmalıdır. Amma elmi və iqtisadi inkişaf üçün heç bir məhdudiyyət ".yoxdur. İslam Peyğəmbəri buyurur: "Çində də olsa elm ardınca gedin

Əgər istidən və soyuqdan, oddan və buzdan qədərində istifadə olunsa, faydalı olar. İstidən faydalanaq, amma yanmayaq. Soyuqdan faydalanaq, amma donmayaq. .Şərqdən və qərbdən istifadə edək, amma özümüzü itirməyək

?Sual ٢٣: İnsan "la ilahə illəllah" cümləsini deməklə necə xilas ola bilər

Cavab: Belə bir xilas haqqında danışan hədislərdə təkcə dil hərəkəti nəzərdə tutulmur. (Hədisin ərəbcə bəyanı belədir: "qulu la ilahə illəllahu tuflihu."(١)

Tuflihu" "cücərmə" mə`nasındadır. Əkinçiyə ərəbcə "fəllah" deyilir. Çünki o," toxumların cücərməsi üçün çalışır. İstənilən bir toxumun torpaqdan cücərməsi üçün üç :şərt var

.Kök torpağın dərinliyinə işləməlidir .١

.Kök qida maddələrini sormalıdır .٢

.Cücərmə üçün toxumun üst fəzası açıq olmalıdır .٣

Tövhid fəzasına ucalmaq istəyən insan da əqidəsini dərin məntiqlə möhkəmlətməli, inkişaf üçün zəruri olan bütün imkanlardan faydalanmalı, qarşıdakı maneələri aradan .qaldırmalıdır

Sual ٢٤: Necə demək olar, cəhənnəm əzabına dözərəm, amma Allahdan ayrılığa ?dözmərəm

Cavab: Övladını görmək üçün yolun isti-soyuğuna dözərək bir məntəqədən o birinə səfərə çıxmış ana deyir:"Yolun isti soyuğuna dözərəm, amma övladımın ayrılığına yox!" Həzrət Əli (ə) "Kumeyl" duasında deyir: "Xudaya! Əzabına səbr edərəm, bəs ayrılığına "?necə səbr edim

?Sual ٢٥: Cinsi ehtiras, şəhvətə qarşı nə edək

Cavab: Bu meyli Allah yaratdığı üçün onu birdəfəlik boğmaq düzgün deyil. İnsan nəslinin davamı üçün zəruri olan bu meylə, sadəcə, nəzarət etmək lazımdır. İştaha olmasa, insan acından ölər, qəzəb olmasa yaşamaq uğrunda mübarizə olmaz şəhvət

olmasa, insan nəsli kəsilər. Amma ehtirası halal yolla tə`min etmək lazımdır. Ehtiras qaz balonu kimidir. Düzgün istifadə edilsə fayda verər, nəzarətsiz qalsa partlayışa .səbəb olar

Bəzənib-düzənmə qadınlar üçün təbii istəkdir. Əgər qadın evdə öz həyat yoldaşı üçün bu işi görərsə, ailədə məhəbbət artar. Amma qadının bəzənib küçəyə çıxması ailənin möhkəmliyini sarsıdır. Küçədə yüzlərlə bəzənmiş qadınlarla rastlaşan kişi öz həyat .yoldaşına qarşı biganə olur

Subay insanlar isə ehtirası oyadan mənzərələrlə qarşılaşdıqda psixoloji rahatlığını itirir, şam tək yanır. Gördüyü mənzərələrdən ehtirası alovlanmış insanların bə`ziləri özünü cilovlaya bilir, bə`ziləri isə hətta cinayət yolu ilə də olsa, bu ehtirası söndürməyə çalışır. Ehtirası alovlanmış bə`zi gənclər evdən qaçır, özünü öldürür, müxtəlif cinsi .xəstəliklərə yoluxur

?Sual ۲۶: İnsan nə dərəcədə azaddır

Cavab: Allah insanı azad yaratmış və ona seçim imkanı vermişdir. Bə`ziləri deyirlər ki, insan özünü azad hiss etsə də, əslində məcburdur. Amma insanın azad olduğunu .sübut edən dəlillər çoxdur. Bu dəlillərdən bə`zilərini xatırlayaq

İnsan çox zaman qarşısındakı iki yoldan hansını seçmək barədə düşünür və .۱ .nəhayət, bu yollardan birini seçir. Bu seçim azaddır

Bə`zən insanlar bir-birlərini tənqid edərək hansısa işdən çəkindirirlər. Demək, insan .۲ .bir işi görə də bilər, bu işdən çəkinə də bilər

Hər bir insan hansısa sözlərinə və işlərinə görə peşman olur, “ey kaş, belə .۳ !olmayaydı” deyir. Demək başqa cür də rəftar etmək olarmış

Əgər uşaqlar ailə, müəllim, tərbiyəçi vasitəsi ilə tərbiyə olunursa, demək, doğru yolu .۴ .tuta bilər

Bəli, tərəddüd, tənqid, peşmanlıq və tərbiyə azadlığın dəlilləridir. Azadlıq təkcə insanların yox, eləcə də, heyvanların istəyidir. Qəfəsə salınmış quş çox vaxt yeməkdən

Hətta behiştdə də ən böyük ne`mətlərdən biri azadlıqdır. Behiştə daxil olan mö`minlər .(həmin azadlığa görə Allaha təşəkkür edərlər (bax: “Zümər”, ۷۴

Bununla belə insan öz Allahının göstərişlərinə əməl etməlidir. Sərhəd bilməyən azadlıq, azğın nəfsə itaət insanı fəlakətə aparır. Ağılın təsdiq etmədiyi azadlıq başqalarının .haqlarına təcavüzdür

?Sual ۲۷: Bir zərrə şirk və riyakarlıq qatqısı olan əməl nə üçün qəbul olunmur

Cavab: Allah buyurur ki, ən üstün şərik mənəm, həm mənə, həm də başqasına görə görülən əməldə öz payımı mənə şərik edilənə verirəm, əməlinizin savabını ondan (alın.(۱)

Bəli, istənilən bir kəsi və istənilən bir şeyi Allahla yanaşı tutmaq Allahın məqamını alçaltmaqdır. Əgər sizə desələr ki, həm sizi, həm də üstündə durduğunuz daşı sevirik, bu sözlər sizi alçaltmazmı?! Əgər sizi qonaq çağırıb, süfrə arxasında öz itləri ilə yan-?yana oturtsalar, sizə də pişiklərinə də eyni yeməkdən versələr, alçalmazsınızmı

Bundan əlavə, Allah göstərişlərinin məqsədi insanın təkamülüdürsə, şirk və riyakarlıq insanı süquta uğradır. Öz taleyində Allahdan başqasını tə`sirli bilməklə insan bütün xeyir əməllərini puça çıxarır, kiçik bir siçan böyük toy qazanına düşməklə onu zaya .çıxardığı kimi

Bir dəfə sərnişinləri təyyarəyə mindikdən sonra hamını yenidən yerə düşürdülər. Bildirdilər ki, xidmətçi təyyarədə siçan görüb və bu siçan tapılana qədər uçuş baş tutmayacaq. Demək, kiçik bir siçan nazik bir naqili gəmirməklə təyyarəni süquta uğrada bilir. Bu siçanı şirkə bənzətsək onun qıra biləcəyi sim Allahla bəndə arasındakı .rabitəyə uyğun gələr

?Sual ۲۸: Allah hamıya məhrəm olduğu halda, namazda örtünməyi vacib edən nədir



---

.Вәсаил”, ч. ۱, с. ۷۲“ [۲۲]-۱

Cavab: Geyim yalnız naməhrəmə görə yox, həm də ədəbə görədir. İnsanlar, adətən evdə sadə geyinir, evə qonaq gəldikdə isə ehtiram göstərərək paltarlarını dəyişirlər. .Daha böyük məclislərə də`vət olunanlar xüsusi geyim geyirlər

Ərlə arvad, valideynlə övlad bir-birlərinə məhrəm olsalar da qarşılıqlı hörməti qorumaq üçün geyimsiz qalmırlar. Elə bu məqsədlə də namaz vaxtı kamil geyim şərt .sayılır

?Sual ۲۹: Ruhumuzun, daxili tutumumuzun böyüməsi üçün nə edək

Cavab: Həzrət Əli (ə) buyurur: “Ruhunda Allah əzəmətli olan şəxs üçün başqa hər nə (varsa cılızdır.”(۱

Yer üzündə olduğumuz vaxt bir hektar torpaq bizə böyük görünür. Amma təyyarədən baxdıqda onun kiçik olduğunu müşahidə edirik. Dünya banklarının hesabına nəzər saldıqda xəzinəmizdəki pul əhəmiyyətsiz görünür. Əgər bütün yaranmışların Allaha .oxuduğu həmd-sənanı nəzərdən keçirsək, dediyimiz zikrlərin kiçikliyini anlayarıq

İmam Səccaddan (ə) soruşdular: “Nə çox ibadət edirsən?” Həzrət buyurdu: “Mənim ”!ibadətim hara, Əlinin ibadəti hara

Allah Qur`anda öz peyğəmbərinə buyurur ki, keçmiş peyğəmbərlərin çətinliklərini yada sal ki, sənin üçün asan olsun. Bəli, insan keçmiş ilə qürrələnməməli, qarşıdakı yol .haqqında düşünməlidir

?Sual ۳۰: Hansı günahlar bağışlanmır

Cavab: Allah kiçik günahların bağışlanacağını və`d etsə də, bu günahları təkrarlamaq (olmaz. Rəvayətdə oxuyuruq: “Kiçik günahlardan çəkinin.”(۲

Çünki insan kiçik günahlardan bir o qədər də utanmadığından bu günahları təkrarlayır .və tövbə barədə düşünmür



---

.Нәһҹул-бәлағә”, х. ۱۹۳“ [۲۳]-۱

Əgər borclu şəxs borcunun azlığını əsas tutaraq verdiyi borcu tələb edən şəxsi qınasa, borc verən həmin pulu bağışlamaz. Amma böyük miqdarda borcu olan insan borc verən şəxsdən üzr istəyib xəcalət çəksə bu borc ona bağışlana da bilər. Bəli, insan .dikbaşlıqla yox, peşmanlıqla bağışlanır

?Sual ٣١: Bütün işlərdə Allahı xatırlamaq nə üçündür

(Cavab: Hədisdə oxuyuruq: "Hər işdən qabaq "Bismillah"ı təzələyin.(١

Hər hansı bir zavodun və ya fabrikin məhsullarına baxsanız, hər birində uyğun müəssisənin ştampını görərsiniz. Bütün başçıların stolunun üstündə, gəmilərdə və təyyarələrdə ölkənin bayrağı olmalıdır. Bəs Allaha inamlı insan bütün işlərdə onun təsirli olduğunu bildiyi halda onu xatırlamaya bilərmi?! Həzrət İbrahim (ə) buyurur: "Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi olan Allah (üçündür."(٢

İslam Peyğəmbərinə buyurulur: "Rəbbinin adı ilə oxu."(٣); "Elə ki, azad oldun, qalx dua (et; və ancaq Rəbbinə yalvar."(۴

?Sual ٣٢: Bizimlə həmfikir olmayan ailə və övladla necə rəftar edək

Cavab: Peyğəmbər (s) Məkkədən Mədinəyə hicrət etdiyi vaxt ona qoşulmaq istəyən müsəlmanlardan bə`ziləri ailə və övladlarının e`tirazı ilə qarşılaşdılar. Nazil olmuş ayədə onlara müraciət olunurdu ki, bə`zilərinizin arvad və uşaqları sizinlə düşməndir, onlardan uzaqlaşın. Hicrət etmiş müsəlmanlardan bə`ziləri hətta tövbə etmiş ailələrini qəbul etməmək qərarına gəlmişdilər. Ayənin davamında buyurulur: "Onlardan özünüzü gözləyin. Amma tövbə etsələr bağışlamağınız sizin



---

Бинар", ч. ۶٣, с. ۴٢١" [٢۵]-١

.Ənam", ١۶٢" [٢۶]-٢

.Әлэг", ١" [٢٧]-٣

.Инширah", ٧, ٨" [٢٨]-۴

(üçün daha yaxşıdır. Həqiqətən Allah bağışlayan və rəhm edəndir."(۱

?Sual ۳۳: Allah zalımlara və günahkarlara nə üçün möhlət verir

Cavab: Su və elektrik enerjisi təchizatı idarələri bütün mənzillərə su və işıq verir. Kimi .bundan düzgün istifadə edir, kimi qaydaları pozur

Allah insanı azad yaratmışdır və hər bir insanın təkamül imkanı vardır. Əgər insan .doğru yolu seçmirsə, özü müqəssirdir

Bəs nə üçün Allah zalımın qarşısını almır? Çünki yalan danışan lal edilsə, məzluma sillə vuranın əli qurudulsa, xainin gözləri çıxarılsa, insanlar Allaha itaətə məcbur olar. Məcbur itaətin isə dəyəri yoxdur. Yalnız öz iradəsi ilə Allaha üz tutan insanlar sitayişə layiqdirlər. Naməhrəmə baxmadığına görə kor adamı imanlı hesab etmək .məntiqsizdir. Allah insanların azad şəkildə yol seçməsini istəyir

Sual ۳۴: Əsrin imamının, həzrət Mehdinin (ə) zühurunu gözləyənlər zülmün qarşısında ?susmalıdırmı

Cavab: Biz hər gecə, səhəri gün günəşin doğması intizarında oluruq. Amma bu o .demək deyil ki, bütün gecəni işıqsız qalmalıyıq

Qış aylarında hamı yayın intizarını çəkir. Bununla belə, yayadək hamı soba qalayır və .qızınır

Əsrin İmamının (ə) zühurunadək hamı öz qüvvəsi daxilində zülmlə mübarizə aparmalı, cəmiyyətin islahına çalışmalıdır. Hədisdə buyurulur: "Ən üstün əməl fərəc, yə`ni həzrət (Mehdinin (ə) zühuru intizarında olmaqdır."(۲

Hədisdən göründüyü kimi, intizar hal yox əməldir. Ona görə də bu zühuru gözləyənlər .əməl sahibi olmalıdırlar. İmamı gözləyənlər saleh olmalıdırlar



---

.Тәғабун", ۱۴" [۲۹]-۱

.Бинар", ч. ۷۵, с. ۲۰۸" [۳۰]-۲

Qeybət dövründə insanların vəzifəsi özünütərbiyə, əmr be mə`ruf və nəhy əz .münkərdir

.Bəli, qonaq gözləyən adam hazırlıq görməlidir

?Sual ۳۵: İnsanların fəsada yuvarlandığı bir dövrdə islam hökuməti qurula bilərmi

Cavab: İslam hökuməti o demək deyil ki, cəmiyyətin bütün fərdləri ədalətli olsun. Başçıları İslam qanunlarını əsas götürən bir hökumət İslam hökumətidir. Səfər o zaman yaxşı hesab olunur ki, sürücü mahir, maşın isə saz olsun. Səfərin necəliyində müsafirlərin vəziyyəti əsas götürülmür. “Bəqərə” surəsinin ۱۰۲-ci ayəsində oxuyuruq: ”.”Yəhudilər Süleymanın hakimiyyətinə dair şeytanların oxuduqlarına uydular

Bundan əlavə ədalət eyni münasibət demək deyil. Ədalətli həkim hər xəstəyə onun xəstəliyinə uyğun dərman yazır, ədalətli müəllim hər şagirdə onun biliyinə uyğun qiymət verir. Əgər bütün xəstələrə eyni dərman, bütün şagirdlərə eyni qiymət verilsəydi, bu ədalətsizlik olardı. Gözlə qulaq, dağla dəniz eyni deyil. Fərq yalnız .ədalətsizlikdən doğmur. Bə`zən ədalət özü fərq qoyulmasını tələb edir

Zülmdən doğmuş ixtilaflar və bərabərsizliklərlə mübarizə aparmaq lazımdır. .Təcavüzkarların zülm ilə topladıqları kapitallar onların gözündən tökülməlidir

Amma görülən işə, iste`dada, ixtisasa, məs`uliyyətə fərq qoyulmazsa cəmiyyətdə .inkişaf dayanar, insanlarda təkamül həvəsi sönükər

?Sual ۳۶: Kafirlərə və günahkarlara necə yanaşmaq lazımdır

Cavab: Hədisdə buyurulur ki, özünü başqalarından üstün bilən şəxs təkəbbür əhlidir.(۱) İnsanların aqibətini bilmədiyimiz üçün onlar haqqında tələsik mühakimə yürüdə .bilmərik. Bə`zən günahkar sonda mö`min, mö`min isə sonda günahkar olur



---

.Мүстәкбир”; “Биһар”, ч. ۷۰, с. ۲۲۶“ [۳۱] -۱

İmam Sadiq (ə) buyurur: “Bir ömür səhv yolda olmuş sehrbazlar Musanın mö`cüzəsini görüb, Fir`onun hədələrinə baxmayaraq iman gətirdilər. Şeytan isə altı min il ibadətdən sonra yolunu azdı. Ona görə də doğru yolda olanlar arxayınlaşaraq .başqalarını qınamamalıdırlar

?Sual ٣٧: “Smeye sədr” nədir

Cavab: Bu ifadə böyük ruha malik olmaq mə`nası daşıyır. Gövdəli ağaclar güclü .küləklərə sinə gəldiyi halda, bu küləklər zərif fidanları kökündən qoparır

(Həzrət Əli (ə) buyurur: “Hər bir məs`uliyyətin qəbulu üçün böyük ruh əsas şərtdir.”(١

Həzrət Musa (ə) peyğəmbərlik məqamına çatdıqdan sonra Allahdan bu ne`məti istəyir.(٢) Amma Allah Musa istəməmişdən qabaq bu ne`məti ona əta etmişdi: “Məgər (biz sənin köksünü açıb genişlətmədikmi?!”(٣

?Sual ٣٨: İslamda keyfiyyət, yoxsa kəmiyyət əsas götürülür

Cavab: İslamda bə`zən kəmiyyətə, bə`zən də keyfiyyətə əhəmiyyət verilir. Məsələn, camaat namazında adamların sayı nə qədər çox olarsa, savab da bir o qədər çox olar. Amma sədəqənin miqdarı yox, sədəqə verənin səmimiyyəti (ixlas) əsas götürülür. Əhli-beytin yetimlərə, miskinlərə və əsirlərə verdiyi sədəqələr miqdarına görə yox, .onu verənlərin xalisliyinə görə yada salınır

Bə`zi məqamlarda həm keyfiyyət, həm də kəmiyyət əsas sayılır. Məsələn, Qur’an həm (çox zikr etməyi, həm də müt`i olmağı tapşırır.(٤

?Sual ٣٩: İslami cəmiyyət quruculuğunda cihadın rolu nədir



---

١- [٣٢] “Нəhчул-бəлағə”, h. ١٧۶.
٢- [٣٣] “Ta-ha”, ٢٧.
٣- [٣۴] “Инширah”, ١.
۴- [٣۵] “Əhзaб”, ۴١; “Му`минун”, ٢.

Cavab: Belin ağız hissəsi daim iti və ağ yuxarı hissəsi isə qalın və qara olur. Cihad edən millət də öz gənclərini əldən verməsinə baxmayaraq daim üzüağdır. Amma zülmə boyun əyən xalqlar zahirən asayişdə olsalar da, say çoxluğuna baxmayaraq .üzüqaradırlar

?Sual ۴۰: Mükafat və əzab verilərkən şəxsiyyət nəzərə alınacaqmı

Cavab: Qur`an peyğəmbərlərin xanımlarına buyurur: "Sizdən hansı biriniz açıq-aşkar çirkin iş görsə, onun əzabı ikiqat olar; Hər kim Allaha və rəsuluna itaət edib yaxşı işlər (görsə, onun mükafatını ikiqat verərik."(۱

Uca zirvəli dağların uçurumları da dərin olur. Hədisdə oxuyuruq: "Alimin bir günahı (bağışlanana qədər cahilin yetmiş günahı bağışlanar."(۲

,Nə qədər yuxarı dırmansa insan

.Daha çox əzilər yıxılar zaman

**dən ۶۰–a kimi olan suallar–۴۱**

?Sual ۴۱: İslam cəmiyyətində rəhbərin rolu nədir

Cavab: Hər bir hərəkət bir neçə ünsürdən ibarətdir: başlanğıc, yol, vasitə, bələdçi və məqsəd. Bu beş ünsür arasında bələdçi daha mühüm rol oynayır. Əgər bələdçi və ya .rəhbər alim və pəhrizkar olarsa, yolçular yolunu azmaz

Layiqli rəhbərə xalq itaət etsə, bütün çətinliklər həll olar. İynə iti, sap möhkəm bağlı olarsa, istənilən bir parçanı tikmək olar. Sap iynədən çıxdıqda isə ən nazik parçanı belə tikmək mümkünsüzdür. Sapsız iynə gecə-gündüz işləsə belə, faydasız olar. Mahir sürücü nasaz maşını tə`mir edib yoluna davam etdiyi kimi, peyğəmbərlər də ən çətin ictimai şəraitlərdə öz ümmətlərini tərbiyələndirə bilmişlər. Ləyaqətsiz rəhbər isə naşı sürücü kimi ən qiymətli avtomobili hərəkətə gətirə bilmədiyi tək, öz xalqını işığa çıxara .bilmir

?Sual ۴۲: Haqq yolda ünvanımıza səslənən təhqirlər və danlaqlara nə cavab verək

Cavab: Bir şəxs icarəyə dəvə götürüb Qahirədən Əbbasiyyəyə gedirdi. Dəvənin cilovunu tutmuş dəvə sahibi müsafirinin tənhalığından istifadə edib onu məsxərəyə qoymuşdu. Qarşılarına çıxan bir şəxs üzünü müsafirə tutub dedi: "Eşitmirsənmi sənə nələr deyilir? Nə üçün dinmirsən? " Müsafir dedi: "Əgər bu şəxs məni Əbbasiyyəyə ".çatdırsa, danışdığı sözlərin heç bir əhəmiyyəti yoxdur

Mütəffifin" surəsində oxuyuruq ki, günahkarlar mö`minlərə daim gülür, yanlarından" keçərkən naz-qəmzə edir, dalda da onları məsxərəyə qoyur, üz-üzə gəldikdə onları azğın adlandırırdılar. Amma mö`minlər əzmlə öz yollarına davam edirdilər. Qur`anda (və`d olunur ki, mö`minlər kafirlərə gülər.(۱

Sual ۴۳: Abır-həyanı qorumaq üçün yağış namazından imtina etmək olarmı? (Axı bu (...namazdan sonra yağış yağmasa, şəxsiyyətə nöqsan gələ bilər

Cavab: Yarış meydanına çıxan idmançı məğlub da ola bilər. Bununla belə, o, qələbə ümidini itirmir. Napaleon on dörd hərbi əməliyyatda məğlub olduqdan sonra qələbəyə .yol tapır

Rəvayətlərə əsasən, quraqlıq zamanı yağış namazı qılmaq lazımdır. Yağışın yağıb-.yağmayacağı Allahdan asılıdır. Amma biz öz vəzifəmizə əməl etməliyik

Sual ۴۴: Dini mərasimdə iştirak edən insanın dindarlığı mə`lum olur. Bu iştirak riya, ?özününümayiş deyilmi

Cavab: Əvvəla, özününümayiş bə`zən haram olmur. Məsələn, bir-biri üçün bəzənən ər və arvad üçün bu iş ibadət sayılır. Camaat namazı haqqında İslamın verdiyi göstərişlərdə də məqsəd dinin əzəmətinin nümayişidir. İmam Hüseyn (ə) əzadarlığı .zamanı yürüşlər də nümayiş xarakterli ibadətdir



---

۱- [۳۸] "Мутэффифин", ۲۹-۳۴.

Eləcə də, tanınmış şəxslərin, məs`ulların dini mərasimlərdə iştirakı başqaları üçün bir .növ təbliğdir və belə bir təbliğ ibadətdir

Özününümayiş o zaman haramdır ki, bu işdə eqoizm amil olsun. Demək, özünü yaxşı .qələmə vermək üçün özününümayiş ibadətdir

?Sual ۴۵: Acı hadisələrlə qarşılaşarkən nə etməli

Cavab: Süfrədə həm turşu və istiot, həm də konfet və mürəbbə ola bilər. Uşaqlar adətən şirin şeylərə üstünlük verirlər. Hansı ki, turş və acı şeylərin də faydası var. Bəs acı hadisələrin faydası nədir? Acı hadisələr diqqəti Allaha yönəldir, iste`dadı .çiçəkləndirir, günahlar üçün cəza olur, ilahi ne`mətləri nəzərə çarpdırır

Hadisələrə münasibətdə insanlar üç qrupa bölünür: kimi uşaq tək narahat olur, kimi gənclər kimi səbr edir, kimi də yaşlılar kimi ləzzət alır. Qur`ana əsasən, çətinliklərlə (üzləşən vaxt kimi hay-haray salır, kimi səbr edir, kimisi də razı qalır.(۱

Bir qrup şəxs İslam peyğəmbərinin hüzuruna gəlib, cihada getmək istədiklərini bildirdilər. Həzrət (s) onlara minik və qılınc olmadığını bildirdikdə çox narahat olub ağladılar da. Çətin hadisələrdən tədbir, səbr, ilahi yardım vasitəsi ilə qurtulmaq olar. !Baxın, limon kimi turş meyvədən limonad kimi şərbət düzəldilir

Bəli, mahir aşpaz hətta portoğal qabığından mürəbbə hazırlayır. Dünyada, demək olar .ki, bütün tullantılar təkrar e`mala qayıdır

Həzrət Zeynəb (ə) hətta öz əsirliyindən istifadə edərək zalımların səltənətini titrətdi. Yezid, imam Səccadın nitqi eşidilməsin deyə, azanın ucadan deyilməsini tapşırdı. İmam isə həmin azanın cümlələrini elə təfsir etdi ki, eşidənlər təlatümə gəldi. Azanın “şəhadət verirəm ki, Məhəmməd Allahın rəsuludur” cümləsindən sonra buyurdu: “Ey !Yezid



---

.Мəaрич”, ۲۰; “Бəгəрə”, ۱۵۴, ۱۵; “Əhзaб”, ۲۳“ [۳۹] -۱

"!?Bu Məhəmməd sənin babandır yoxsa mənim?! Bu əsirlər onun övladları deyilmi

İmam Kazim (ə) zindana salındığı vaxt "nə yaxşı ibadət yeridir"-buyurdu. Bir çox .alimlər öz dəyərli kitablarını məhz sürgünlərdə və zindanlarda yazmışlar

?Sual ۴۶: İslam dini küfr ölkələri ilə əlaqələrə necə baxır

Cavab: İslam fitrət dinidir. İnsan isə fitrətən azadlığa meyllidir. Müsəlmanların azadlığına xələl gətirməyən əlaqələr İslamda mümkün sayılır. Ana paltarını bulaşdıran uşaqdan qaşığı alıb özü yedirtmək istəyəndə uşaq e`tiraz edir. O, hər vəchlə müstəqil .olmağa can atır

İslamın ilk on ilində müsəlmanlar ibadət zamanı üzlərini Beytül-müqəddəsə tuturdular. Mədinəyə hicrətdən sonra yəhudilərin "hanı sizin öz qibləniz" kinayələri ilə qarşılaşan peyğəmbər isə vəhy intizarında idi. Nəhayət, vəhy nazil oldu və Allah müsəlmanlara (Məscidül-həramı (Kə`bə) qiblə tə`yin etdi.(۱)

Müsəlmanların hər hansı bir işdə özünü kafirlərə oxşatması da haramdır. Özünü .kafirlərə oxşadanlar əslində müsəlmanlığı alçaldırlar

?Sual ۴۷: Daimi dünya çətinliklərinin səbəbi nədir

Cavab: Qab-qacaq mağazasının vitrini önündən keçən bir şəxs ağzıaşağı düzülmüş stəkanları görüb, mağazaya daxil olur və satıcıya deyir:"Nə üçün bu stəkanların ağzı bağlı, altı isə deşikdir?" Satıcı stəkanı götürüb, çevirir və bu şəxsə deyir: ".“Görürsünüzmü? Hər iki problem həll oldu

Bəli, bə`zi problemləri yaradan bizim yanlış təsəvvürümüz olur. Dünyanın imtahan olması barədə bir bu qədər danışılsa da çoxları elə başa düşür ki, dünya ləzzət üçündür. Sanki bir şəxs kitabxanaya girib duş axtarır. İnsan anlamalıdır ki, dünya sanatoriya yox, təkamül meydanıdır. Çətinlik olmayan yerdə isə təkamüldən söhbət .belə gedə bilməz

Qur`an buyurur: “Çətinliklər və təzyiqlər insana dəqqət üçündür.` Bəli, ud ağacını yandırmadan onun ətrini duymaq olmaz. Avtomobilin təkəri təzyiqlə tənzimləndiyi kimi, acı hadisələr də insanı tənzimləyir, onun qəflət və təkəbbürünü aradan qaldırır, .kəşf və ixtiralara səbəb olur

?Sual ۴۸: Əməl olunmayan imanın dəyəri varmı

Cavab: Qur`anda iman daim saleh əməllə yanışı xatırladılır. İmanla əməl iynə ilə sapın oxşarıdır. Sapsız iynə bir iş görə bilmədiyi kimi, əməlsiz iman da tə`sirsizdir. Qur`an (buyurur: “Allahı sevirsinizsə, peyğəmbərə itaət edin.”(۱

Çoxları özlərini imanlı hesab etsələr də saleh əməldən uzaqdırlar. “Allahı sevirik” deyirlər, amma onunla söhbətdən qaçır, namaz qılmırlar. “Əlini sevirik” deyirlər, amma özlərin ona oxşatmırlar. “Əsrin imamını gözləyirik” deyirlər, amma heç bir hazırlıq görmürlər. Aşiqlik iddiasında olanın mə`şuqu razı salması bu insanların sədaqətini şübhə altına alır. Nəql edirlər ki, qədim qul bazarlarından birində bir qula çox böyük qiymət qoyulmuşdu. Səbəbi bu idi ki, bu qul susamış adamı tanıyırdı. Bir tacir qulun bu xüsusiyyəti ilə maraqlanıb, onu alır. Bir qonaqlıq düzəldib, süfrəyə sudan başqa hər şey qoyur. Qonaqlar növbənöv xörəklərdən yeyib su istəyirlər. Kim ağzını açıb su istəyirsə, qul onun susuz olmadığını iddia edir. Nəhayət, qonaqlardan biri ayağa qalxıb .su ardınca gedir. Qul gülümsəyib, “bəli, bu adam susuzdur” deyir

Doğrudan da iddiasına sadiq olan insan yerində oturmur. İmana uyğun əməl etməyən .şəxsi mö`min saymaq səhvdir

?Sual ۴۹: Həyatımızda Əhli-beyt sevgisinin nə rolu var

Cavab: İdeal axtarışı, hər hansı qəhrəmana pərəstiş insanın fitri xüsusiyyətidir. Ləyaqətli ideal insanın tərbiyəsi üçün çox tə`sirlidir. Kamil ideal insanı daha çox cəzb edir. Əhli-beyt sevgisi ən üstün ideal seçimidir. Belə bir ideal seçən insan



---

.Али-Имран”, ۳۱“ [۴۱] -۱

özünü peyğəmbər davamçılarına oxşatmağa çalışır. İnsanı hərəkətə gətirməyən sevgi isə həqiqi sevgi deyil. Bir körpə atasından qoğal istəsə və atası ona işdən qayıdarkən qoğal alacağını söz versə, uşaq gözünü yola dikib atasını gözləyir. Axşam ata mənzilə daxil olan kimi körpə “qoğal almısanmı” soruşur. Əgər ata desə ki, “qoğal almamışam, amma səni çox sevirəm”, uşaq bu sevgiyə inanarmı?!

Sual ۵۰: Həqiqəti demək vacibdirmi?

Cavab: Həqiqəti gizlətmək haramdır. Amma həqiqəti deməyin də şərtləri var. Münasib şərait olmadan deyilən həqiqət fəsad yaradır.

Şəkər tozu şirindir. Amma onu birbaşa uşağın ağzına töksək, uşaq boğular. Şəkər suda həll edilib uşağa tədricən verilməlidir.

Əksər insanlar həqiqəti birbaşa qəbul etmək iqtidarında deyillər. Hamamda başına vedrə ilə su tökən adamın başına küçədə bir stəkan su töksəniz, sözsüz ki, cırnayar.

Müsəlmanların alimlərə hörməti, xüms və zəkat ödəməsi onların bu dəyərlərə dərin inamına əsaslanır. Əziyyətli yollar keçib mə`sumların ziyarətinə gedənlər küçədə rastlaşdıqları hər adama salam verməyi zəruri hesab etmirlər. Çünki hər hansı bir münasibət üçün tanışlıq və münasib şəraitə ehtiyac var.

Sual ۵۱: Həzrət Mehdinin (ə) min illik bir ömürdən sonra qırx yaşında zuhur edəcəyinə necə inanaq?

Cavab: Adətən, kirpiklərimiz on illər boyu dəyişməz qalır. Hansı ki, insanın saçı və saqqalı daim inkişafdadır. Həm kirpiyin, həm də saçın tükləri eyni bir orqanizmdən qidalanır. Amma Allahın iradəsi ilə bu tüklərdən biri sabitdir, o biri isə dəyişkən.

İnsan ömrünün məhdudluğunu sübuta yetirəcək heç bir dəlilimiz yoxdur. İşıq məhdud olmadığı kimi, ömür yolu da sərhədsizdir. Qur`anda Nuhun min ilə yaxın yaşadığı, Əshabi-Kəhfin üç yüz il yatdığı bildirilir.

?Sual ۵۲: Qur`an nəzərincə, rəhbərlə xalqın əlaqəsi necə olmalıdır

Cavab: İki növ itaət: insan bə`zən qorxu və tamahdan, bə`zən isə iman və məhəbbətdən itaət edir. Məsələn, insanları Fir`on qarşısında müt`i edən qorxu idi.(۱) (Amma İslam peyğəmbərinə itaətin arxasında iman və məhəbbət dururdu.(۲

İslamda xalqla rəhbər arasındakı əlaqə “vilayət” kimi tə`bir olunur. “Vilayət”dedikdə sevərək bir şəxsin ardınca getmək nəzərdə tutulur.(۳) Vilayətə tabe olan şəxs özünü başqalarından üstün tutmur.(۴) Həzrət Əli (ə) buyurur: “Döyüşlərdə Peyğəmbər (s) düşmənə bizdən daha yaxın olardı.” Həzrət Peyğəmbər (s) xalqa salam göndərmək üçün mə`mur edilmişdir.(۵) Eləcə də, Peyğəmbərə salam göndərmək xalqa əmr olunmuşdur.(۶) Demək, rəhbərlə xalq arasındakı əlaqə qorxuya yox, eşq və .məhəbbətə əsaslanır

?Sual ۵۳: Xüms və zəkatla dövlət vergiləri arasında nə əlaqə var

Cavab: Vergi vətəndaşların dövlətə xidmət müqabilində ödədikləri puldur. Dövlət küçə və prospektləri asfaltlayır, asayişi tə`min edir, pulsuz tibbi xidmət göstərir, təhsil müəssisələri açır. Demək, vergi gündəlik ehtiyaclarımıza xərclədiyimiz pullardan fərqlənmir. Xüms və zəkat isə yalnız məhrum təbəqənin problemlərinin həllinə sərf .olunur



---

.Зухруф”, ۵۴“ [۴۲] -۱

.Али-Имран”, ۱۵۹“ [۴۳] -۲

.Сад”, ۸۶“ [۴۴] -۳

.Кәhф”, ۱۱۰” [۴۵] -۴

.Төвбә”, ۱۰۳“ [۴۶] -۵

.Төвбә”, ۵۶“ [۴۷] -۶

?Sual ۵۴: Nə üçün bə`zi insanlar mö`cüzə görsələr də, iman gətirmirlər

Cavab: Peyğəmbərlərin inkar olunmalarının bir neçə səbəbi vardır: babalara təqlid, .şəxsi mənafenin qorunması, eqoistlik, yersiz təəssüb

Ulduzlu gecədə elektrik lampası altında oturan insan göydəki ulduzları görə bilmir. .Eləcə də, özünə vurğun insan başqalarının üstünlüklərini qiymətləndirə bilmir

Bir atlı nə qədər cəhd etdisə, at qarşısındakı arxdan keçmədi. Bunu müşahidə edən arif atlıya məsləhət gördü ki, arxın suyunu bulandırsın. Atlı belə də etdi. At heç bir məcburiyyətsiz sudan keçdi. Atlı bu işin hikmətini anlamayıb, arifdən səbəbini soruşdu. "!Arif dedi: " At saf suda öz əksini görür və öz əksini tapdamaq istəmir

Bəli, insan da belədir o, öz mənliyini, məqamını, mənafeyini, tayfasını, millətini, partiyasını tapdaya bilmir. Elə buna görə də haqqında danışılan at kimi hərəkət edə .bilmir

Sual ۵۵: Peyğəmbərlər və imamlar günahsız (mə`sum) olduqları halda nə üçün tövbə ?edib ağlayırdılar

Cavab: Böyük bir salonu qismən işıqlandırsaq yalnız böyük əşyaları görə bilərik. Amma .bu salon tam işıqlandırılsa ən kiçik əşyaları da görmək olar

Adi insanların iman nuru zəif olduğundan onlar yalnız böyük günahları görə bilir. Peyğəmbər və imamların iman nuru isə o qədər güclüdür ki, səmərəsiz ötüşən bir an .onları çox narahat edir

Ayağı ağrıyan adam üçün ayağını uzatmaq nə haramdır, nə də məkruh. Bununla belə o, ayağını uzadarkən ətrafdakılardan üzr istəyir. Demək, insan halal bir işdən də xəcalət çəkə bilər. Televiziyada son xəbərləri oxuyan diktor asqırdıqda .tamaşaçılardan üzr istəyir. Əslində isə asqırmaq günah deyil

Allahın övliyaları Onun əzəmətini dərk etdiklərindən ən dəyərli ibadətin də bu əzəmət .qarşısında yetərsiz olduğunu anlayırlar

Sual ۵۶: Fərqli mübarizə metodlarından istifadə edən mə`sum imamların arasında ?məqsəd fərqi varmı

Cavab: Bütün imamların məqsədi tövhiddir və bu məsələdə şübhəyə yer yoxdur. Amma hər bir imamın hərəkəti mövcud şəraitə görə fərqlənmişdir. Qayçının iki ağzı bir-birinə zidd hərəkət etsə də əslində eyni bir işi görür. Komanda oyunlarında hər oyunçu öz mövqeyinə uyğun hərəkət etsə də, ümumi məqsəd komandanın .qələbəsidir

Bəli, bütün imamların məqsədi insanların təkamülüdür. Amma bu məqsədə çatmaq üçün bə`zən vuruşmaq, bə`zən elmlə məşğul olmaq, bə`zən hicrət etmək, bə`zən də .susmaq lazım gəlir

?Sual ۵۷: Necə olur ki, bə`zi günahlar bütün savabları puça çıxarır

Cavab: Əgər bir şəxs müəyyən müəssisədə iyirmi il xeyir işlə məşğul olduqdan sonra müəssisə müdirinin övladını qətlə yetirərsə, gördüyü işlər puça çıxar. Bir top mərmisi dəydiyi binanı uçurub, yüzlərlə insanın zəhmətini bir anda bada verir. Bir söyüş illərin dostluğuna son qoyur. Bir qaşıq zəhər bütün sağlamlığı məhv edir. Sükan arxasında bir an yuxu avtomobili uçuruma yuvarladır. Bir dəfə bıçağın gözə toxunması onu illər .uzunu kor edir

Bəli, bir qığılcım böyük meşəni külə döndərdiyi tək, bə`zi günahlar da bütün savabları məhv edir.(۱) Amma elə yaxşı əməllər də var ki, insanın bütün keçmiş pis əməllərini (yuyub aparır.(۲

Bir fəhlə müəssisədə illər uzunu səmərəsiz işlədiyi halda, müəssisə rəhbərinin övladını ölümdən qurtarmaqla hörmət



---

.Бəгəрə", ۲۱۷" [۴۸] -۱

qazana bilər. Qur`an buyurur: “Namaz bütün pislikləri və çirkinlikləri aradan qaldıran (yaxşı əməldir.”(١)

?Sual ٥٨: İnsan hansı yolla qəlbini ilahi məhəbbətlə işıqlandıra bilər

Cavab: Hər bir məhəbbət insana verilən ne`mət və ona göstərilən xidmətə diqqətdən .asılıdır. İnsan Allahın ne`mətlərini düşündükcə Ona sevgisi artır

Külək, yağış, günəş, dağlar, çəmənlər, qidalar, ailə, övlad, əql, elm, dil, göz, qulaq, gecə, gündüz, ayıqlıq, yuxu, azadlıq, seçim imkanı, yaxşılığa meyl, pisliyə nifrət insan ömrünü iflic vəziyyətdən çıxaran ümumi ne`mətlərdir. Bilirsinizmi iki-üç gün susuz, !?yuxusuz, ac qalan insan nə vəziyyətə düşür

Hər bir fərdə əta olunmuş özünəməxsus iste`dadlar Allahın xüsusi ne`mətlərindəndir. İnsan öz varlığını diqqətlə nəzərdən keçirsə, kimsədə olmayan xüsusiyyətlərlə .rastlaşar

Bəli, ne`mətləri düşünmək insanın qəlbini ilahi eşqlə doldurur, onu Allah qarşısında səcdəyə vadar edir. Bütün bunları nəzərə alaraq Qur`an ilahi ne`mətlər barədə (düşünməyi tapşırır.(٢)

?Sual ٥٩: Həyat çətinliklərinin fəlsəfəsi nədir

Cavab: Çətinliklər iki qisimdir: Özümüzdən asılı olan çətinliklər və bizdən asılı olmayan .çətinliklər

Bir çox çətinliklər insanın diqqətsizliyindən yaranır. Əgər bir şəxs öz iqtisadiyyatını .düzgün tənzimləməyib iflasa uğrayırsa, özü müqəssirdir

.Körpəni nəzarətsiz buraxdığımız üçün o, suda batırsa özümüz günahkarıq

Sağlamlığına biganə qalıb xəstələnən, yol hərəkəti qanunlarını pozub qəzaya uğrayan, özünü intizamlı apara

.bilmədiyi üçün təhqir olunan insanların hər biri özü təqsirkardır

:Bizdən asılı olmayan çətinliklərin bir sıra səbəbləri vardır

Çətinliklər insanı inkişaf etdirir. Elmi kəşflər və ixtiralar çətinliklərlə üzbəüz dayandıqda .baş tutur

Bir çox günahların kəffarəsi məhz acı hadisələrdir. Bu acı hadisələr insan ruhunu .möhkəmləndirir

İslam peyğəmbəri (s) buyurmuşdur: "Xəstəlik, kasıblıq və ölüm olmasaydı, insanın (qüruru sınmaz, o heç zaman baş əyməzdi."(۱)

Başına hadisə gəlmiş insanın kamalı artır, hadisə ötüb keçdikdən sonra o, başqalarının .çətinliklərini daha asan anlayır və onlara kömək əlini uzadır

?Sual ۶۰: Nə üçün bütün ömrünü elmə sərf etmiş bə`zi alimlər Allaha iman gətirmir

Cavab: Allaha iman insanın elmindən yox, iradəsindən asılıdır. Nərdivan ustası düzəltdiyi nərdivanlara çıxmırsa, bu o demək deyil ki, nərdivan dırmaşmaq üçün deyil. İynə haqqında deyilən "hamını bəzər, özü lüt gəzər" tapmacası belə alimlərə çox uyğun gəlir. Bə`ziləri güzgü satılan dükanda işləsə də, özünə baxıb, yaxalığını düzəltmək barədə düşünmür. Amma güzgünü alanlar dərhal güzgüyə baxıb, özlərini səliqəyə salırlar. Bir çox alimlər təbiət hadisələrini öyrənsələr də, bu hadisələri tənzimləyən qüvvə ilə maraqlanmırlar. Kimi yerə düşmüş pulu götürüb sahibini axtarır, .kimi də sakitcə cibinə qoyub yoluna davam edir

**dən ۸۰–a kimi olan suallar–۶۱**

?Sual ۶۱: Nə üçün insanlar fərqli yaradılıb

Cavab: Əlinə qələm götürmüş yazıçı əgər bütün səhifələrdə hərfləri eyni ardıcıllıqla düzsə, onun yazdığına heç kim kitab deməz, onunla maraqlanmaz. Əgər sözlər, "cümlələr, səhifələr bir-birindən fərqlənirsə bunu zülm adlandırmaq olmaz. "T

!hərfi deyə bilməz ki, nə üçün mən ayaq üstə qalmışam, amma “ş” oturub

Qab-qacaq sexində müxtəlif ölçülü qablar hazırlansa da, kimsə sex rəisini bu fərqə .görə ittiham etmir. Çünki, hər ölçüdə olan boşqabın öz tə`yinatı var

İnsanların fərqli yaradılması zülm yox hikmətdir. Hər bir insan ona verilmiş imkanlar həddində cavabdehdir. Ömür boyu korları məsxərəyə qoyub, özü naməhrəmə baxmaqdan çəkinməyən insan qiyamət əzabı ilə qarşılaşacağı vaxt –“kaş kor olaydım” .deyə təəssüf edəcək

?Sual ۶٢: İnsanın əməl naməsi nə vaxt bağlanır

Cavab: Toy salonunda işıqları söndürüb qaçan adamı ədalətlə cəzalandırmaq üçün işığın sönməsi nəticəsində baş verən bütün hadisələr nəzərə alınmalıdır. Bəli, qaranlıq səbəbindən qab-qacağın sınmasında, adamların pilləkəndən yıxılmasında, uşaqların qorxmasında, bir sözlə, tədbirin pozulmasında həmin şəxs təqsirkardır. Quran buyurur ki, həm əməllər, həm də onların nəticələri yazılır.(١) Hədisdə deyilir ki, yaxşı bir işin bünövrəsini qoyan adama sonralar da bu işi görənlərin savabı verilir. Eləcə də, insanlar (üçün pis bir yol düşünən adam o yolu gedən bütün adamların günahına şərikdir.(٢

Bir şəxs kiməsə siqaret çəkməyi öyrədirsə, ikinci şəxs üçüncüyə, üçüncü dördüncüyə .bu pis vərdişi ötürürsə, birinci şəxs bütün sonrakıların günahına şərikdir

Hədisdə oxuyuruq ki, valideyn övladın, yaxşı işlərinə ibtidai sinif müəllimi şagirdin .sonrakı dövrlərdə müvəffəqiyyətlərinə şərik olur

Sual ۶٣: Nə üçün Qur`anda başqalarının qeybətini etmək qardaş meyitinin ətini ?yeməyə bənzədilir

səh:٣٢

---

.Yasin”, ٣٢“[٣٩] -١

.Kənzül-Ümmal”, h. ۴٣٠. ٧٩“[۴٠] -٢

:Cavab: “Hucurat” surəsinin ١٢-ci ayəsindəki bu bənzətmənin müxtəlif səbəbləri var

Ölü özünü müdafiə edə bilmədiyi kimi, qeybəti olunan şəxs də söhbətdə iştirak . ١ .etmədiyindən özünü müdafiə edə bilmir

Ölüyə vurulan yara sağalmadığı kimi, qeybəti olunan şəxsin itirilmiş hörmətini . ٢ qaytarmaq da mümkünsüzdür. İnsana vurulan maddi ziyanı ödəmək olur, amma açılmış eybi yenidən örtmək qeyri-mümkündür. İstər ciddi, istərsə zarafata edilən .qeybət günahdır

Bədəndəki ət tədricən artdığı kimi, insanın hörməti də zərrə-zərrə artır. Hər hansı bir .٣ insanın bu sayaq çətinliklə qazandığı hörməti onun qeybətini etməklə bada vermək !necə də böyük cinayətdir

?Sual ۶۴: Tövbə nədir

Cavab: Yolu səhv salmış sürücü əvvəlcə geri qayıtmalı, sonra yoluna davam etməlidir. Amma səhv yolu davam edərək yalnız dildə “səhv etmişəm” desə heç vaxt mənzilə .çata bilməz

Tövbə səhv yoldan qayıtmaqdır. Getdiyi səhv yolu geri qayıdanı Allah sevir və onun (tövbəsini qəbul edir.(١

Tövbəkar yediyi haqları sahibinə qaytarmalıdır. Oğurlanmış məbləğ qaytarılmazsa və ya həmin şəxsdən halallıq alınmazsa, tövbənin qəbul olması qeyri-mümkündür. Qəsb etdiyi məbləği qaytarmağa utanan şəxs bu işi özünü tanıtmadan da görə bilər. Hansı .yolla olur olsun, həmin məbləğ sahibinə çatdırılmalıdır

Tövbəkar incitdiyi adamdan üzr istəməli, qılmadığı namazların qəzasını qılmalı, gizlətdiyi həqiqəti açıqlamalı, səhvlərini islah etməlidir. Qur`anda “tövbə və “islah” (kəlmələri, adətən yanaşı işlənir.(٢

Tövbə yubandırılmamalıdır. Çünki üst-üstə yığılmış günahları yumaq çətin olur. Paltarın üzərinə qonmuş tozu

۱- [۵۵] “Бәгәрә”, ۲۲۲; “Төвбә”, ۱۰۴.

۲- [۵۶] “Бәгәрә”, ۱۶۰.

.təmizləmək asandırsa, qat kəsmiş palçığı təmizləmək çətindir

?Sual ۶۵: İnsanları yaxşılığa necə də`vət edək

:Cavab: İnsanları həqiqətə müxtəlif yollarla çağırmaq olar

Bir çox ayələrdə buyurulduğu kimi, əsas də`vət yollarından biri sözlə (dillə). ۱ .də`vətdir

Əməli də`vət. Qur`an “libasını təmizlə” buyurur.(۱) Yə`ni insan əvvəlcə özünü. ۲ .təmizləməlidir

Birbaşa də`vət. Qur`an “xoş danışın, namaz qılın, zəkat verin”, deyə əmr edir.(۲) .۳ .İnsanları birbaşa da haqqa çağırmaq olar

Dolayı də`vət. İnsanlara Qur`andan əhvalatlar danışmaqla onlara doğru yolu. ۴ göstərmək olar. Məsələn, qardaşlarının, oyun bəhanəsi ilə Yusifi aldadıb quyuya atdıqlarından xəbərdar olan həmsöhbətiniz başa düşər ki, düşmənlər insanı idman .pərdəsi altında yolundan azdıra bilər

.Ümumi də`vət. Allah öz peyğəmbərinə bütün xalqı də`vət etməyi buyurmuşdur .۵

(Xüsusi də`vət. Peyğəmbərlər öz ailələrini doğru yola də`vət edirdilər.(۳ .۶

(Qohumları də`vət.(۴ .۷

(Həmvətənləri də`vət.(۵ .۸

(Bəşəriyyəti də`vət.(۶ .۹

Bəli, mərcan gəzən üzgüçü, ova çıxmış balıqçı dənizin bir nöqtəsində durub qalmamalı, .böyük qazanc istəyində olan tacir dükanda çeşidləri artırmalıdır

?Sual ۶۶: Nə üçün irsdən kişinin payı qadından ikiqat çoxdur

۱- [۵۷] “Мүддәссир”, ۴.

۲- [۵۸] “Бәгәрә”, ۸۳.

۳- [۵۹] “Әһзаб”, ۵۹; “Мәрјәм”, ۵۵.

۴- [۶۰] “Шүәра”, ۲۱۴.

۵- [۶۱] “Ән`ам”, ۹۲.

۶- [۶۲] “Ә`раф”, ۱۵۸.

Cavab: Günəmuzd işləyən fəhlənin maaşı rəsmi işçinin maaşından çox olur. Bu o demək deyil ki, fəhlə işçidən daha şəxsiyyətlidir. Sadəcə günəmuzd fəhlədən fərqli olaraq rəsmi işçi mə`zuniyyətə çıxır, təqaüd alır, idarənin verdiyi başqa hüquqlardan .istifadə edir

İslamda qadının irs payı az olsa da, ailənin bütün xərcləri kişinin boynundadır. Qadın .bütün xərcini ərdən alır, irs payını və mehriyyəsini yalnız özünə sərf edir

?Sual ۶۷: Qadın nə üçün hakim (qazı) ola bilməz

Cavab: Allah qadını övlad tərbiyəsi üçün yaratdığından onun qəlbində xüsusi bir mərhəmət, mehribanlıq, canıyananlıq qoymuşdur. Bu mərhəmət və sevgi ədalətli mühakimə üçün problem yaradır. Hakim elə cinayətkarlarla görüşür ki, bu cinayətkarlar öz yalanları ilə insanı ovsunlayırlar. Prinsipiallığı olmayan hakim saxta .göz yaşlarına aldanır, qəti qərar çıxarmaqda çətinlik çəkir

Əslində hakimlik çox ağır məs`uliyyət tələb etdiyindən kişi üçün imtiyaz sayılmamalıdır. Qadın zərif məxluq olduğundan belə bir məs`uliyyətdən azad .edilmişdir

?Sual ۶۸: Nə üçün qadının diyəsi (qanbaha) kişidən iki dəfə azdır

Cavab: Diyə insanın qiyməti yox, dəymiş zərərin əvəzidir. Bir şəxs kişini öldürürsə, bütöv bir ailənin maddi tə`minatı üçün problem yaradır. Ona görə də kişinin qanbahası .daha çoxdur

Əgər diyə şəxsiyyətdən asılı olsaydı, onda alimi öldürənlər daha böyük qanbahası .ödəməli olardılar. Hansı ki, bütün kişilərin diyəsi eynidir

İslam hüququ nöqtəyi-nəzərindən həzrət Əlinin ibn Mülcəmlə heç bir fərqi yoxdur. Ona görə də həzrət Əli (ə) öz qatili haqqında belə buyurdu: "O mənə bir zərbə vurdu, siz də ona bir zərbə vurun".(۱) Əgər diyə şəxsiyyətdən asılı

.olsaydı, dünyanın var-dövləti həzrət Əlinin (ə) diyəsini ödəməzdi

?Sual ۶۹: Nə üçün bə`zilərinin aqibəti çox pis olur

Cavab: Məsələn, siqaret çəkmək kimi zahirən kiçik eyiblər bə`zən o qədər üst-üstə .yığılır ki, ürəyin fəaliyyəti dayanır

Qur`anda buyurulur ki, daim xırda-xırda pis iş görənlər, nəhayət bir gün Allahı inkar (edir və əzaba düçar olurlar.(۱)

?Sual ۷۰: İnsanın ölümü Allahın, yoxsa Əzrailin əlindədir

Cavab: Allah Qur`anda bə`zən bir işi həm özünə, həm də bir başqasına aid edir. Bə`zən insanların canının öz tərəfindən, bə`zən isə Əzrail tərəfindən alındığını bildirir.(۲) Elə ayələr də var ki, insanın canının mələklər tərəfindən alındığı bəyan olunur.(۳) Əslində hər üç tə`bir məqbuldur. “Açar qapını açdı”, “əlim qapını açdı; özüm qapını açdım” tə`birləri arasında ciddi bir fərq yoxdur. Çünki açar əlin, əl isə mənim .ixtiyarımdadır

Mümkündür ki, mələklər canı çıxarıb Əzrailə, Əzrail isə Allaha təhvil verir. Belə də ola bilər ki, adi insanların canını mələklər, yaxşı insanların canını Əzrail, övliyaların canını .isə Allah alır

?Sual ۷۱: Görünməyən Allaha necə iman gətirək

Cavab: Yer üzünü nə qədər nəzərdən keçirsək, daş-torpağı labaratoriyada analiz etsək, cazibə adlı qüvvəni görə bilmərik. Amma ağacdan almanın düşməsi sübut edir ki, belə bir qüvvə var. Demək, bir şeyin varlığına inanmaq üçün onu görmək şərt deyil. Cazibə qüvvəsi heç bir hiss üzvü ilə qeydə alınmasa da onun tə`sirləri göz .qabağındadır

?Sual ۷۲: Qur`an nəzərincə, başqalarına nə dərəcədə kömək etməliyik



---

.Рум”, ۱۰; “Мəһəммəд”, ۱۰“ [۶۴] -۱

Cavab: Qur`an buyurur ki, bütün yardımlarınızın mükafatı var.(۱) Həm az, həm də çox köməyin əvəzi var. Bə`zən suya atılmış bir sarı yarpaq bir dəstə qarışqa üçün gəmi olur. Küçədə qoyulmuş avtomat telefonla danışmaq üçün kağız pul kara gəlmədiyi kimi, bə`zən başqalarının da böyük yox, çox kiçik köməyə ehtiyacı olur. Yaranı bağlamaq üçün adyal yox, bir qarış cuna kifayətdir. Böyük nasosun görə bilmədiyi işi .kiçik şpris görür

Hədisdə oxuyuruq: "Heç bir yaxşılığı kiçik saymayın ki, ola bilər bu yaxşılıq köməyinizə çatsın. Heç bir günahı kiçik hesab etməyin ki, ola bilər bu günah sizi süquta uğratsın. Futbol topuna batan xırda mıx bütün oyunu saxlaya bilər. Yerə düşmüş yemiş qabığı .ən güclü pəhləvanı yerə yıxmaqla şikəst edib, evdə oturda bilər

?Sual ۷۳: Nə üçün günahkarlar Qur`andan faydalana bilmir

Cavab: Əgər bir gölməçəyə insan meyiti düşsə, uzun müddət yağış yağmasına baxmayaraq bu gölməçədən üfunət çəkilməyəcəkdir. Demək, üfunətli suya qatışan .pak yağış suyu tə`sirsiz olur

Qur`an rəhmət yağışı olsa da kafirlərin çirkin qəlbini paka çıxarmır. "İsra" surəsinin ۸۲-ci ayəsini oxuyuruq: "Biz mö`minlər üçün şəfa və mərhəmət olan Qur`an ayələri nazil ".edirik. Bu ayələr zalımların ziyanını artırır

İnsan qəlbindəki tərslik suya düşmüş murdar kimidir. Hər ayə nazil olanda kafirlər .daha çox müqavimət göstərir, daha çox inadkar olurlar

?Sual ۷۴: Yuxu vaxtı cism və ruh hansı vəziyyətdə olur

Cavab: Qur`anda buyurulur: "Allah ölüm zamanı insanların canını alır, ölməyənlərin (canını isə yuxuda çıxarır."(۲

Bə`zən sürücü öz maşınını dayanacaqda saxlayır, bə`zən isə yol kənarında işlək .vəziyyətdə qoyub, işinin ardınca gedir

.Hər iki halda sürücü maşında olmasa da, ikinci halda maşın işlək vəziyyətdədir

Yuxu vaxtı ruh cismdən uzaqlaşsa da, cism işlək vəziyyətdədir. Ölüm vaxtı isə cism .“söndürüldükdən” sonra ruh ondan birdəfəlik uzaqlaşır

?Sual ۷۵: Allah mərhəmətlidirsə, nə üçün bəndələrini cəzalandırır

Cavab: Ağzı möhkəm tıxaclanmış butulkanı dünyanın ən böyük okeanına atsanız, bu butulkaya bir damla su daxil ola bilməz. Həmin butulka ilə su götürmək istəyən insan !?özünü, yoxsa okeanı məzəmmət etməlidir

Bə`zi insanlar bütün xilas qapılarını bağlayıblar. Onlar nə düşünmək, nə ibrət götürmək, nə həqiqəti dinləmək, nə də haqqa boyun əymək istəyir. Qur`an tə`birincə onlar daşdan da bərkdirlər.(۱) İnsanı imandan məhrum edən, ilahi rəhmətin azlığı yox, .özünün qapalı olmasıdır

?Sual ۷۶: Dini göstərişlər bir-birlərinə bağlıdırlarmı

Cavab: Ayə və rəvayətlərdən mə`lum olur ki, bütün dini göstərişlər bir-birlərinə bağlıdırlar. İyirmidən çox ayədə “namaz” və “zəkat” sözləri yanaşı işlədilir. Rəvayətdə .buyurulur ki, zəkatsız namaz qəbul deyil

Bəli, Allahla rabitə (namaz) və xalqla rabitə (zəkat) qoşa qanad kimidir. Mə`nəvi .təkamül üçün qoşa qanad zəruridir

Peyğəmbər (s) namaz qılanların zəkat ödəməsinə çox diqqət verərdi. Bir çox dini göstərişlər yalnız tam halda qəbul olur. Məsələn, həcc əməlləri yalnız başa çatmaqla (qəbul olur.(۲) İftar vaxtından bir dəqiqə qabaq açılan oruc da məqbul deyil.(۳



---

۱- [۶۹] “Бəгəрə”, ۷۴.

۲- [۷۰] “Бəгəрə”, ۱۹۶.

۳- [۷۱] “Бəгəрə”, ۱۸۷.

?Sual ٧٧: İbadət dedikdə yalnız namaz və oruc nəzərdə tutulur

Cavab: Allahın razılığını qazanmaq məqsədi ilə görülən bütün işlər ibadətdir. Körpə .qızcığazı yaxşı işlərə həvəsləndirmək üçün ona sırğa almağınız da ibadətdir

Mütaliəyə məşğul olan müəllimin məqsədi pul qazanmaqdırsa, bu mütaliə ibadət deyil. Amma bu müəllimin Allaha xatir mütaliə etdiyini düşünüb ona həvəslə xörək .hazırlayan aşpaz ibadətlə məşğuldur

Bəli, günü kitabxanada keçən insan cəhənnəmə, mətbəxdə ömrünü başa vuran .aşpazın behiştə getməsi mümkündür

?Sual ٧٨: Qur`anda "ilahi sünnətlər" dedikdə nə başa düşülür

Cavab: Parlamentdə çıxarılan qanunlar iki növdür: Qanunların bir qismi parlament .quruculuğuna, digər bir qismi isə cəmiyyətin quruculuğuna aid olur

Allahın da qanunlarının bir qismi özünə, digər bir qismi isə insanlara aid olur. Allahın özü üçün tə`yin etdiyi qanunlar, məsələn, hidayət, hesab, ruzi vermə, himayə, rəhmət (qanunları ilahi sünnət adlanır.(١

.İnsanlar üçün tə`yin olunmuş qanunlar isə əhkam adlanır

?Sual ٧٩: Çürümüş bədənlər qiyamət günü necə diriləcək

:Cavab: Bir neçə misala nəzər salaq

Nehrəyə bir qədər qatıq və su töküb çalxalayın. Yağ dənəciklərinin bir yerə . ١ yığışdığını görəcəksiniz. Allah da yeri hərəkətə gətirməklə əzaları bir yerə (toplayacaqdır.(٢

İnsanın yarandığı nütfə müxtəlif qidalardan zərrə-zərrə toplanır. Torpaqdakı . ٢ maddələr buğdanın meyvənin canına sovrulur, sonra insan orqanizminə keçib nütfəni .formalaşdırır. Demək, insan torpaq zərrələrindən vücuda gəlir

١- [٧٢] “Ғафир”, ٥١; “Ән`ам”, ٥۴; ”Һуд”, ۶; “Гашиjə”, ٢١; “Ләjл”, ١٢; “Əhзаб”, ١٣٨.

٢- [٧٣] “Зилзал”, ١.

Məgər mal-qaranın əti və südü yediyi otlardan yaranmırmı?! Otdan süd çıxaran Allah .۳
?ölünü torpaqdan çıxara bilməzmi

?Sual ۸۰: İnsanı bircə günah məhv edə bilərmi

Cavab: Bə`zən kiçik bir virus insanın bütün orqanizmini iflic edir. Bir çınqı yüz mərtəbəli binanı kömür parçasına döndərir. Bir an paxıllıq insanı qətlə vadar edir. Bir anlıq vəzifəyə tamah insanın əlini imamın qanına bulayır. Adətən hər adi günah daha böyük günah üçün şərait yaradır. "Qazandığı günahlarla əhatə olunan insanlar (cəhənnəmlikdirlər."(۱

Həya pərdəsi yırtıldıqdan sonra günah etmək asanlaşır. "Kumeyl" duasında oxuyuruq:
".“Allahım, ismət pərdəsini yırtan, paklığı viran qoyan günahlarımı bağışla

**dən ۱۰۰–ə kimi olan suallar–۸۱**

?Sual ۸۱: Məsciddə Amerikaya, İsrailə (Ermənistana) ölüm şüarları vermək olarmı

Cavab: Qur`an müsəlmanları belə tanıtdırır: "Məhəmməd (s) Allahın rəsuludur və (onunla olanlar kafirlərə qarşı sərt və bir-birlərinə qarşı mərhəmətlidirlər."(۲

Kafirlərə qarşı ölüm şüarları oxumaq ayədəki "sərtliyin" bir nümunəsidir. Əlbəttə ki, .şüarla kifayətlənmək olmaz və bu sərtlik əməldə də özünü büruzə verməlidir

Qur`anda Peyğəmbərin xanımlarına buyurulur ki, yumşaq danışsanız, düşmən (tamaha düşər.(۳

Amma bu gün peyğəmbər xanımları yoxsa da, ayədə mühüm bir siyasi işarə var: müsəlmanlar mərhəmətli olsalar da, düşmənlə yumşaq davranmamalıdırlar. Bizim .yumşaqlığımız pusquda durmuş düşmən üçün yaşıl işıq yandırır



---

.Бәгәрә", ۸۱" [۷۴] -۱

.Фәтh", ۲۹" [۷۵] -۲

.Əhзаб", ۳۲" [۷۶] -۳

?Sual ۸۲: Kafirlərə qarşı nümayişlərdə iştirak etmək vacibdirmi

Cavab: Qur`an buyurur: “Kafirlərin qəzəbinə səbəb olan bir yerə ayaq basanlar üçün saleh əməlin mükafatı yazılar.”(۱)

Müqəddəs amallar məqsədi ilə keçirilən nümayişlərdə də iştirak etmək ibadət olmaqla yanaşı, xalqın ruhunu gücləndirən də`vətdir.

?Sual ۸۳: Nə üçün dini hökmlərdə müctəhidə təqlid edilməlidir

Cavab: Həyatımızda elə bir sahə yoxdur ki, mütəxəssisə ehtiyac olmasın. Din bilicisi olan müctəhidlər özləri də xəstələndikləri vaxt həkimə müraciət edirlərsə, həkimin dini məsələdə müctəhidə təqlid etməsi nə üçün təəccüb doğurmalıdır.

Qur`an buyurur: “Bilmədiyinizi zikr əhlindən soruşun.”(۲)

.Diqqət etməliyik ki, söhbət adi alimdən yox, təqva sahibi olan zikr əhlindən gedir

Rəvayətlərə əsasən agah, adil, həva-həvəsdən uzaq alimlərə təqlid olunmalıdır. Sənədsiz ev, avtomobil qeyri-qanuni hesab olunduğu kimi, təqlidsiz əməl də batildir.

?Sual ۸۴: Vilayət nədir

Cavab: Cəmiyyət rəhbərə ehtiyaclıdır. Rəhbərsiz cəmiyyət hərc-mərcliyə məhkumdur. Rəhbər islamşunas, savadlı, şücaətli, təqvalı, dünya hadisələrindən xəbərdar bir müsəlman olmalıdır. Layiqli rəhbəri xalqın seçdiyi islamşünaslar tə`yin etməlidir.

Sual ۸۵: Əsrlər keçdikdən sonra peyğəmbərin göstərişlərinə həvəslə əməl olunmasının səbəbi nədir?

:Cavab: Peybəmbərlərin müvəffəqiyyətlərinin bir sıra dəlilləri vardır



---

۱- [۷۷] “Төвбә”, ۱۲۰.

۲- [۷۸] “Нəhл”, ۴۳.

.Paklıq, xalislik, canıyananlıq, nöqsansız keçmiş .١

.Dəlil və məntiq .٢

.Öz dediklərinə şəxsən əməl etmələri .٣

.Geniş qəlb və xoş rəftar .۴

.Göstərişlərin insan fitrətinə uyğunluğu .۵

.Göstərişlərin bütün ehtiyaclara cavab verməsi .۶

.Göstərişlərin asanlığı .٧

Həkim iynədən qorxan uşağı ələ almaq üçün deyir: "Əzizim bütün xəstələrə iynə vurulur. İynənin ağrısı üçə sayanadək keçəcək. Əgər indi iynə vurulmasa, sonra daha çox iynə vurulmalıdır." Mümkün olduqda həkim uşağı tabletlə müalicə etməyə üstünlük verir. Görün Allah öz bəndələrini oruca necə də`vət edir: "Ey iman gətirənlər, əvvəlki ümmətlərə vacib olduğu kimi oruc sizə də vacib oldu. Bəlkə, bu yolla pis işlərdən (çəkinəsiniz; Oruc sayı müəyyən olan günlərdir..."(١)

!?Bu ayələrlə həkimin dedikləri arasında oxşarlıq görürsünüzmü

?Sual ٨۶: Bütün işlərimizə ilahi rəng vura bilərikmi

Cavab: Qur`an buyurur ki, işlərinizə ilahi rəng verin.(٢) İlahi rəng vurmaq Allahın .razılığına uyğun iş görməkdir

Məsələn, xanımınıza aldığınız paltarı ona həzrət Fatimənin (ə) doğum günü təqdim etsəniz, işinizə ilahi rəng vurmuş olarsınız. Bir yerdə əyləşərkən üzüqibləyə əyləşsəniz .Allahın razılığını qazanarsınız

Həzrət Əli (ə) qonaq gedərkən əvvəlcə evdə yeyər, sonra gedərdi. Soruşanlara .bildirərdi ki, qonaqlığa getməkdə məqsəd mö`minlə görüş olsa daha yaxşıdır

Qur`anda bəyan olunur ki, axirət üçün çalışan insan dünyadan da faydalanırsa, dünya .üçün çalışan insan axirətdən məhrum olur

Cavab: İnsan bə`zi şeyləri bilməsə yaxşıdır. Qur`an buyurur: “Qanınızı qaraldacaq (şeylər barəsində soruşmayın.”(١

Dövlət bir neçə günlük taxıl ehtiyatı qaldığını xalqa bildirdikdə insanlar narahat olub, ehtiyat toplamağa başlayır, iqtisadi durum bir qədər də ağırlaşır. Amma yaxşı olar ki, .dövlət belə bir xəbəri yaymaq əvəzinə taxıl tədarükü üçün çalışsın

:Qur`an bütün bilikləri üç qismə ayırır

Faydalı elmlər. Həzrət Musa (ə) belə bir elmə sahib olmaq üçün Xızra yoldaş olmaq .١ (istəyir.(٢

.(Zərərli elmlər (bax: “Bəqərə”, ١٠٢ .٢

Nə faydası nə də zərəri olan elmlər. Məsələn, Kəhf əshabının sayını bilməyin nə .٣ .(zərəri var, nə də faydası (bax: ”Kəhf”, ٢٢

.Tarixdə zərərli biliklərdən qorunmaq üçün hicrət edənlər az olmayıb

?Sual ٨٨: Dini qəbul etməyən adama son sözümüz nə olsun

Cavab: Sürücülər yolda karlarına gələ biləcək bə`zi şeyləri özləri ilə götürürlər. Ehtiyat təkəri olan avtomobilin yolda təkəri buraxmasa, sürücü bir şey itirmir. Amma ehtiyat .təkəri olmayan avtomobilin təkəri yolda buraxsa sürücü əziyyət çəkməlidir

Bəli, insan ehtimal verdiyi hadisələrə qarşı hazırlıq görməlidir. Ehtiyatlı insan soyuqda .donmaz, yağışda islanmaz

Bəs dində necədir? Peyğəmbərlər ölümdən sonrakı həyat, sorğu-sual haqqında kifayət qədər mə`lumat vermişlər. Xalqın onlara inanan hissəsi sutkada on-on beş dəqiqə namaz qılır, ildə bir dəfə bir ay müddətində oruc tutur və zərərli işlərdən çəkinirlər. Bu insanlar axirətdə bir şey qazanmasalar da (hansı ki, veriləcək) heç nə itirməyəcəklər. Bəs

peyğəmbərlərə inanmayıb, kefindən qalmayan insanlar qiyamət sorğusu düz olarsa ?(hansı ki, düzdür) nə edəcəklər

Bəli, hər bir ağıllı insan ehtiyatlı olmalı, mümkün çətinliklərə hazırlaşmalıdır. Əgər qarşınızdakı insan Qur`an həqiqətlərinə inanmırsa, o, təkcə imansız yox, həm də .ehtiyatsız adamdır

?Sual ۸۹: Ən yaxşı əməl nədir

Cavab: Ən yaxşı əməl Allahın qəbul etdiyi əməldir. Əməlin böyük-kiçikliyi yox, onun .qəbulu şərtdir

Həzrət İbrahim (ə) oğlu İsmailin köməyi ilə Kə`bənin dayaqlarını qaldırarkən Allahdan bu əməli qəbul etməsini istədi.(۱) Demək, görülən iş çox əhəmiyyətli bir iş olsa da .hansısa səbəblərdən qəbul olunmaya bilər

?Sual ۹۰: Allah hansı işləri qəbul edir

Cavab: Əməlin qəbul olması üçün həm hədəf, həm iş, həm də vasitə düzgün olmalıdır. Məsələn, həccə getmək düzgün hədəfdir. Amma oğurluq at ilə bu səfərə çıxmaq nəinki savab deyil, hətta günahdır. Təmizliyi qorumaq yaxşı işdir. Amma qara kömürlə ağ .divara "zibil atmayın" yazmaq özü çirkin bir işdir

Bə`zən isə üsul və vasitə düz olduğu halda hədəf yanlış olur. Həzrət Əli (ə) ilə müxalif olan xəvaric dəstəsi "hökm yalnız Allaha məxsusdur" şüarı ilə çıxış edirdilər. Şüar öz-özlüyündə düzgün olsa da, onu göyə qaldıranlar həqiqəti tapdamaqla məşğul idilər. Qur`anı başına qaldıran insan onun göstərişlərinə əməl etməlidir. Həkimin yazdığı nüsxəni çərçivəyə salıb divardan asan, amma dərmanları qəbul etməyən xəstə !?sağalarmı

?Sual ۹۱: Münafiq kimdir

:Cavab: İnsanlar dörd qismə bölünür

.İman gətirib, saleh əməl edən mö`minlər .۱

.İmansız və saleh əməlsiz kafirlər .۲

.İman gətirdiyi halda, saleh əməldən uzaq olan günahkarlar .۳

İman gətirmədiyi halda, özünü saleh göstərən münafiqlər. Yalan, hiylə, riyakarlıq .۴ .nifaqın bir növüdür

?Sual ۹۲: Mö`minlər arasında münasibət necə olmalıdır

(Cavab: İslam peyğəmbəri (s) buyurub: “Mö`min mö`minin güzgüsüdür.”۱)

.Güzgü kimi, bir-birimizin həm gözəl, həm də nöqsanlı cəhətlərini görək

.Güzgü kimi hər şeyi olduğu kimi, böyüdüb kiçiltmədən göstərək

.Güzgü kimi insanlarla üz-üzə durub danışaq, xəlvətdə yox

.Sevirəm ki, dostlar bir ayna kimi

.Hər zaman üzümə deyə eybimi

,Min dilli daraq tək gəzib xəlvəti

.Nə pisdir edələr tük-tük qeybəti

Güzgü kimi başqalarının nə deyəcəyini düşünməyək

.Güzgü kimi özümüzü toz-torpaqdan qoruyaq

.Eyb göstərdiyi üçün güzgünü sındırmazlar. Eybini deyəni də incitmə

Güzgünü sındıranda onun qırığı da hər şeyi olduğu kimi göstərir. Min bir əzab görmüş .mö`min də yalnız həqiqəti deyir

Güzgü saf olduğu üçün eybi göstərir. Mö`min də kin və həsədə görə yox, saflığına .görə tənqid etməlidir

Güzgü göstərdiyi eybi özündə saxlamadığı kimi, mö`min də üzbəüz dediyi eybi

.yadından çıxarmalıdır

Güzgüyə ötəri baxan eybini görə bilmədiyi kimi, mö`min də diqqətlə dinləməyən .eybindən xəbərsiz qalar

?Sual ۹۳: Həqiqətin qəbuluna tələsməyənlərlə necə rəftar edək



---

.Бинар", ч. ۷۱, с. ۲۷۰" [۸۴] -۱

Cavab: İman düşüncəyə əsaslanmalıdır. Də`vətinizə tələsik verilən cavab sizi sevindirməsin. Tez çiçəkləyən ağaclar soyuğa davamsız olur. Düşüncəyə əsaslanan qəbul daha e`tibarlıdır.

Qur`an belələri haqqında buyurur: "Onlar ayaq üstə, oturduqda və ya uzandıqda Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər və deyərlər: "Ey rəbbimiz! Sən bütün bunları boş yerə yaratmamısan!"(١)

Başqa bir ayədə oxuyuruq: "O kəslər ki, sözü dinləyib, onun ən yaxşısına əməl edərlər."(٢)

Deməli, tələsik çıxarılan qərarın dəyəri yoxdur. İslam peyğəmbərindən (s) düşünüb qərara gəlmək üçün iki ay vaxt istəyən Səffan adlı birinə peyğəmbər dörd ay vaxt verdi.

Amma qarşıda yol aydın olduqda tələsmək zəruridir. Çoxlarını doğru yol seçimində tərəddüdə salan şeytan olub.(٣)

Sual ٩۴: Allah hər növ imanı qəbul edirmi?

Cavab: Qur`an buyurur: "Müşriklər gəmiyə mindikdə Allaha dua edir, sağ-salamat quruya çıxdıqdan sonra isə Allaha şərik qoşurlar."(۴)

Fir`on da dəryada qərq olarkən iman gətirdi. Amma müvəqqəti iman qəbul olunmadığından Allah buyurdu ki, artıq tövbə və iman faydasızdır.(۵) Həyatda da belədir. Evlənmək yox, ailəni saxlamaq əsasdır. Eləcə də doğmaq əsas deyil, övladı tərbiyə etmək əsasdır.

Sual ٩۵: Nə üçün bə`zən dualarımız qəbul olunmur?

Cavab: Allah onu çağıranlara cavab verəcəyini və`d edir.(۶) Amma birindən kömək almaq üçün bə`zi şərtlərə əməl olunmalıdır: dostluq münasibətini qorumaq, dostun ünvanını

١- [٨٥] “Али-Имран”, ١٩١.

٢- [٨٦] “Зүмәр”, ١٨.

٣- [٨٧] “Һәҗҗ”, ١۴.

۴- [٨٨] “Әнкәбут”, ۶۵.

۵- [٨٩] “Јунус”, ٩١.

۶- [٩٠] “Ғафир”, ۶٠.

yadda saxlamaq, yersiz istəklərdən çəkinmək, boş xəyallardan uzaq olmaq, qanunsuz yolla yardım tələb etməmək, başqalarının hüququnu poza biləcək arzulardan uzaq .olmaq və düz danışmaq

Biz Allaha ağız açarkən bu şərtlərə əməl edirikmi? Rəvayətlərdə duanın bə`zi şərtləri bildirilir: “Bismillah” demək, dəstəmaz almaq, qəlbən dua etmək, məscid kimi müqəddəs yerdə durmaq, on dəfə “ya Allah”, “ya rəbbi” demək, salavat göndərmək, ...günahları yada salıb peşman olmaq, tövbə etmək

?Sual ۹۶: Allah bizi tanıyırsa, imtahana ehtiyac varmı

Cavab: Aramızda sinəsinə döyüb, özünü göyə qaldıranlar var. İmtahan bələlərini özünə tanıtdırır. Qur`an buyurur:” Biz sizi qorxu, aclıq, mal, can və qıtlıqla imtahana (çəkərik. Səbr edənlərə müjdə ver.”(۱

İnsanın mükafatlandırılması və ya cəzalandırılması üçün ortada hansısa bir əməl olmalıdır. Bir şəxs peşəkar oğru olsa da, nə qədər ki, oğurluq baş verməyib onu həbs etmək olmaz. Həzrət Əli (ə) buyurur: “İnsanın imtahana çəkilməsinin fəlsəfəsi ona mükafat və cəza vermək üçün zəmin hazırlamaqdır. Bu imtahanlar olmasa da Allah öz .bəndəsini tanıyır

?Sual ۹۷: Dünyanın idarəsi üçün insanlara təqva xüsusiyyəti bəs edirmi

(Cavab: Qur`anda oxuyuruq: “Son qələbə müttəqilərindir.”(۲

Təqva mənəvi keyfiyyət olduğundan, dünya idarəçiliyində bilik və ixtisasa ehtiyac var. “Ənbiya” surəsinin ۱۰۵-ci ayəsində buyurulur: “Yer üzünün varisləri yalnız mənim saleh ”.bəndələrim olacaq

Demək həm bəndəlik, həm də saleh əməl şərtdir. Allah Qur`anın bir hökmünə iman gətirib, o birinə göz yumanları



---

.Бәгәрә”, ۱۵۵“ [۹۱] -۱

məzəmmət edir“.(١) Xəstəlikdən şəfa tapmaq üçün həkimin yazdığı nüsxədəki bütün .dərmanları vaxtlı-vaxtında qəbul etmək lazımdır

?Sual ٩٨: Nə üçün Allah insan həyatı üçün təhlükəli şeylər yaradıb

Cavab: Qur`an buyurur ki, Allah hər şeyi gözəl yaradıb.(٢) İlanın bədənindəki zəhər bir çox ağır xəstəliklərin dərmanıdır. Hansı ki, yanlış olaraq, bu zəhərə nifrət nümayiş .olunur. Axı bıçaq baş kəsmək üçün yox, faydalı işlər üçün nəzərdə tutulub

?Sual ٩٩: Elm olan yerdə vəhyə nə ehtiyac var

Cavab: Heç bir ideologiya, institut, elmi mərkəz insanın mə`nəviyyat yolunu işıqlandırmaq gücündə deyil. Yaşadığımız dünyanı xoşbəxt etməkdə aciz olan elm axirət həyatı üçün nə və`d edir?! İnsan dünyada qısa bir müddət yaşayıb, əbədiyyətə ?qovuşursa, həmin əbədiyyətin tələbləri nədir

Allah taala öz peyğəmbərləri vasitəsi ilə ən doğru yolu işıqlandırır. Öz ağıl və düşüncəsi, elmi və biliyi ilə kifayətlənənlər ilahi nurdan məhrum olur. İlahi biliklərə arxa .çevirən insan özünə zülm edir

?Sual ١٠٠: Düşmən qarşısında vəzifəmiz nədir

Cavab: Qur`an müsəlmanları birliyə də`vət edərək, istənilən bir təfriqəyə qadağa (qoyur.(٣

Yağış damlaları ayrı-ayrılıqda zərif olsalar da, bir hövzəyə daxil olduqda əzəmətli bir təlatüm yaradıb, ağır turbinləri hərəkətə gətirir, böyük şəhərləri elektrik enerjisi ilə .təchiz edirlər

Barmaqlar ayrı-ayrılıqda zəif olsalar da, sıxılıb yumruq yaratdıqda düşməni qorxuya salırlar. Əldəki barmaqların biri



---

.Ниса”, ١٥٠ [٩٣] -١

.Сәчдә”, ٧“ [٩٤] -٢

uzun biri gödək, biri kobud biri incə olsa da, hər barmağın öz işi var. Müxtəlif iste`dadlı .barmaqlar bir yerə toplandıqda isə böyük güc yaranır

Ey əziz müsəlman bacı və qardaşlar! Aranızdakı fərqlərə görə bir-birinizdən uzaqlaşmayın. İnanın ki, eyni uzunluqda, eyni qalınlıqda olan beş barmağın yaratdığı yumruq fərqli barmaqların yaratdığı yumruqdan qat-qat zəifdir. Düşmən qarşısında !yumruq tək birləşin. Qələbə sizin vəhdətinizdədir

!Vəlhəmdulillahi rəbbil-aləmin

**Mündəricat**

## About center

In the name of Allah

هَلْيَسْتَوِيالَّذِينَيَعْلَمُونَوَالَّذِينَلَايَعْلَمُونَ

?Are those who know equal to those who do not know

al-Zumar: ٩

:Introduction

Ghaemiyeh Computer Research Institute of Isfahan, from ٢٠٠٧, under the authority of Ayatollah Haj SayyedHasanFaqihImami (God blesses his soul), by sincere and daily efforts of university and seminary elites and sophisticated groups began its activities .in religious, cultural and scientific fields

:Manifesto

Ghaemiyeh Computer Research Institute of Isfahan in order to facilitate and accelerate the accessibility of researchers to the books and tools of research, in the field of Islamic science, and regarding the multiplicity and dispersion of active centers in this field

and numerous and inaccessible sources by a mere scientific intention and far from any kind of social, political, tribal and personal prejudices and currents, based on performing a project in the shape of (management of produced and published works from all Shia centers) tries to provide a rich and free collection of books and research papers for the experts, and helpful contents and discussions for the educated generation and all classes of people interested in reading, with various formats in the .cyberspace

:Our Goals are

(propagating the culture and teachings of Thaqalayn (Quran and Ahlulbayt p.b.u.t-

encouraging the populace particularly the youth in investigating the religious issues-

replacing useful contents with useless ones in the cellphones, tablets and computers-

providing services for seminary and university researchers-

spreading culture study in the publich-

paving the way for the publications and authors to digitize their works-

:Policies

acting according to the legal licenses-

relationship with similar centers-

avoiding parallel working-

merely presenting scientific contents-

mentioning the sources-

.It's obvious that all the responsibilities are due to the author

:Other activities of the institute

Publication of books, booklets and other editions-

Holding book reading competitions-

Producing virtual, three dimensional exhibitions, panoramas of religious and tourism- places

.Producing animations, computer games and etc-

Launching the website with this address: www.ghaemiyeh.com-

Fabricatingdramatic and speech works-

Launching the system of answering religious, ethical and doctrinal questions-

Designing systems of accounting, media and mobile, automatic and handy systems,- web kiosks

Holding virtual educational courses for the public-

Holding virtual teacher-training courses-

Producing thousands of research software in three languages (Persian, Arabic and- English) which can be performed in computers, tablets and cellphones and available and downloadable with eight international formats: JAVA, ANDROID, EPUB, CHM, PDF, HTML, CHM, GHB on the website

Also producing four markets named "Ghaemiyeh Book Market" with Android, IOS,- WINDOWS PHONE and WINDOWS editions

:Appreciation

We would appreciate the centers, institutes, publications, authors and all honorable .friends who contributed their help and data to us to reach the holy goal we follow

